# Önəmli məsələnin izahı

İmam əl-Əlusi (rahmətullahi aleyhi) demişdir: "Allahdan qeyrisinə ibadət edəni müsəlman adlandıran şəxsə dəlil gətirməkdənsə, daha çox onun öz ağlını müalicə etməyə ehtiyacı vardır." (ğayətul əməni:1/54)


## Toplayıb hazırlayan:

## Əbu İsmayıl

# Müqəddimə

Aləmlərin Rəbbi olan Allaha həmd və sənalar olsun. Peyğəmbərlərin ən şərəflisi Muhamməda, onun ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun.

Bu kiçik risalədə müsəlmanlar arasında böyük ixtilafa səbəb olan önəmli bir məsələyə aydınlıq gətirməyə çalışacağıq.Bir çox insanlar bu məsələ xüsusunda iki yanlış məslək üzərədirlər: İfrata varanlar və səhlənkarlığa düşənlər.Həmin məsələnin İslamın ən öndə əsasları olan iman və küfr haqqında olduğu səbəbilə onun önəmi şübhə doğurmamalıdır.Çünki hər bir müsəlmanın İslam dini üzərə sabit qalması üçün İslamın və tövhidin gerçəyini bilməsi gərəkdir.Lakin bu məsələlərə zənn yaxud ehtimal yaxud təəssübkeşlik yaxud digər yöndən yanaşmaq olmaz.Bu məsələlərə yalnız elmi əsasdan yanaşmaq gərəkdir.Həmin məsələlərdə orta yolu tutmağa müvəffəq olmayan insanlar məhz qeyd olunan səbəblər üzündən yanlış nəticələrə gəlmişlər.

Habelə bir önəmli məsələni də, qeyd etmək yerinə düşərdi. Belə ki, bəzi insanlar iddia edirlər və insanları güya təkfirdən çəkindirmək məqsədilə deyirlər: Cahilliyin üzr olması məsələsi barədə danışanlar və bu mövzunu qaldıranlar təkfirçi və xəvariclərdir. Habelə deyirlər: Əgər birinin bu məsələ haqqında (onların nəfsi istəyinə xoş gəlməyən surətdə) danışdığını gördüyün zaman bil ki, həmin şəxs təkfirçidir!

Lakin bu barədə uzun-uzadı danışmaqdansa qoy alimlərin sözləri ilə bunlara cavab verilsin.

Şeyx Salih əl-Fəuzan (hafizahullah) demişdir: Bəzi cahillər yaxud qərəzli insanlar İslamdan çıxaran səbəblər barədə danışan

şəxslərin sözlərinə irad tutur və bu haqda danışan şəxsləri təkfirçilər adlandırır və onlardan çəkindirirlər.” (şərhu nəvaqidil isləm:20-ci səh)

Şeyx Salih Luheydən (hafizahullah) möhtərəm bir şəxsin növbəti sözlərinə cavab olaraq demişdir: Cahilliyin üzr olması məsələsi haqqında danışan hər bir şəxs əqidəsini gizlədən haddədidir (təkfir yaxud təbdi etməyə meyilli bidətçidir).Şeyx Luheydən cavab olaraq demişdir: Xeyir ey qardaşım, xeyir! Hər bir şəxsin sözü götürülür və rədd edilir.”

İlk öncə qeyd edək ki, bir çox insanlar təkfir məsələsini doğru anlamamış yaxud qərəzli şəkildə insanlara yanlış fikiri aşılamağa çalışmışlar.Belə ki, onlar iddia edirlər ki, əgər müsəlman, şirk edən şəxsin zahiri halına əsasən ona müşrik hökmü çıxararsa, deməli onun qanını, malını və namusunu halal görmüş olacaq.Heç şübhəsiz ki, bu, ən böyük batil və ən dərin zəlalətdir.Bunu dilə gətirən şəxs ya İslamın nurunu söndürməyə çalışan münafiq yaxud da ki, dilə gətirdiyi sözləri anlamayan cahilin birisidir.Çünki həmin məsələnin təfsilatı vardır və məsələni bu surətdə insanlara təqdim etmək açıq-aydın yalandır.Əslində zahirə hökm vermək Əhli Sünnənin sabit qaydaları və əsaslarından biridir. Bu səbəbdən, insanın zahirinə hökm vermək şəriətdə öz təsdiqini tapan qaydadır.İrəlidə buna dair dəlillər qeyd ediləcək.Əslində əqidə və tövhid məsələlərində təhqiq əhli alimlərin yekdilliyi ilə hər hansı bir insan, istər həmin şəxs İslamdan başqa dinə mənsub olsun istərsə də, özünü İslama nisbət eləsin, şirk əməllər edəcəyi zaman, onun zahirinə əsasən ona müşrik hökmü veriləcək.Onun cahilliyində üzürlü olub olmaması məsələsi isə tamamilə fərqli məsələdir ki, bu da irəlidə izah ediləcək.Belə ki, özünü İslama nisbət edən şəxs Allahdan qeyrisinə ibadət edəcəyi, qeyrisinə səcdə edəcəyi,

ona dua edəcəyi, ondan yardım diləyəcəyi, ona təvəkkül edəcəyi, ondan qorxacağı və ibadətin digər növlərini Allahdan qeyrisinə yönəldəcəyi zaman cahil olarsa belə, müşrik hesab olunacaq və beləsi əsla müsəlman adlana bilməz. Ancaq qeyd etmək lazımdır ki, bu, həmin şəxsin zahirinə və durumuna verilən hökm və qiymətdir. Bunun Əhli Sünnənin sabit məzhəbi olduğu təhqiq əhlindən olan alimlərin sözləri vasitəsilə bəyan ediləcək. Habelə məsələnin gerçəyini anlamayan bəzi elmə mənsub olan şəxslər Şeyxul-İslam ibn Temiyyə, Şeyxul-İslam Muhamməd ibn Abdul Vahhab, dəvət alimləri və digər alimlərdən cahilin üzürlü olmasına dair müxtəlif sözlər nəql edir və elə təsəvvür edir yaxud elə təəssürat yaratmağa çalışır ki, həmin alimlər şirkə düşən cahili müsəlman hesab edirlər.Əlsində isə, cahilliyi üzr görmək və şirk vəsfini şirk edənə isbat etmək iki ziddiyət doğurmayan məsələdir.Lakin onlardan bəzisinə deyildikdə ki, bəzən cahil üzürlü olur lakin şirk etdiyinə görə həmin şəxs müşrik adlanır, həmin şəxslər deyirlər: “Bu necə sözdür.Bu söz lap mötəzililərin sözünə oxşadı: İki məqam arasında bir məqam.Yəni, həmin şəxs nə müsəlmandır nə də ki, kafirdir.” Əslində isə elə düşünən şəxs tövhid və əqidə elmində təhqiq əhli olan alimləri mötəzililik, bidət və əsli olmayan sözü söyləməkdə ittiham edir.Bu da onların cahilliyi və tövhidi gerçək surətdə deyil səthi olaraq anlamalarından irəli gəlir.Məgər cahilliyin dərmanı elm deyilmi? Məgər boş-boş danışmaqdansa məsələni Quran və Sünnəyə və böyük alimlərin izahına həvalə etmək gərəkli deyilmi? Təbii ki, alimlərin kəlamlarını saxtalaşdıran şəxslərin çoxluğu səbəbilə adi müsəlmanlar həmin məsələlərdə çaşqınlıq içində olur və hansı mövqeyi tutmaqda tərəddüd edirlər. Alimin hər hansı bir sözünü nəql edib daha sonra həmin sözdən nəfsi istəyə uyğun gələn nəticə çıxaran insanlara təqlid edən şəxslər isə dərhal onların tutduğu yolun doğru digərin isə batil

olduğuna fərəhlənirlər. Lakin bu zavallı bilmir ki, əsrlər boyu alimlərin sözlərini gətirib öz şəxsi etiqadını isbatlamaq üçün avam insanlara onu istədiyi surətdə təqdim edən şəxslər olmuşdur. Məgər Nəcd diyarına gəlib tövhid dəvətini dağıtmaq üçün ibn Teymiyyənin sözlərini yanlış yozan Davud ibn Circis, habelə Osman ibn Mənsur kimi saxtakarlar eyni üslubdan istifadə etməmişlərmi? Habelə hal-hazırda bəzi şəxslər alimlərin sözləri ilə manipulyasiya edirlər. Məsələn deyirlər: Muhamməd ibn Abdul Vahhab Bədəvinin qəbrinə ibadət edənləri və ona səcdə edənləri təkfir etmədiyini deyir.Daha sonra nəticə çıxarır: Deməli həmin şəxslər üzürlüdür və müsəlmandırlar! Həmin adama demək lazımdır: Görəsən onların müsəlman olduqlarını haradan oxudun?! Habelə ibn Teymiyyənin sözlərini oxuyur: Risalətin yoxa çıxması və şəriət elminin azlığı səbəbilə onların bir çoxunu təkfir etmək olmur.Daha sonra nəticə çıxarır: Deməli qəbirə sitayiş edən şəxslər cahilliyi səbəbilə müsəlmandırlar.

Habelə bəzi insanlar Əhli Sünnənin böyük alimlərinin dəlil və sübutlarını buraxıb özləri də qafil olduqları halda müşriklərin dədiyi sözlərdən yapışır və şəhadəti dilə gətirib şirk edən şəxsləri kafir görənləri xəvariclər adlandırırlar.

Şeyx Abdul-Lətif bin Abdur-Rahmən bin Həsən (rahiməhullah) demişdir: “Artıq bu əsirlərdə olan bir çox müşriklər yanlış fikir yürüdüb şəhadəti dilə gətirən şəxsi təkfir edənlərin xəvariclərdən olduğunu zənn etmişlər.Əslində isə şəhadəti tələffüz etmək yalnız onun mənasını bilən, onun tələblərinə əməl edən, ibadəti xalis Allaha yönəldən və Ona heç bir şeyi şərik qoşmayan şəxsi təkfir etmək üçün əngəl olur.Bu cür şəxsə şəhadət kəlməsi fayda verəcək.Ancaq onu dilə gətirən lakin onun tələbinə uyğun Allaha boyun əyməyən, üstəlik Allaha şərik qoşub müxtəlif ortaqlar və

şəfaətçilər edən, onlardan yalnız Allahın qadir olduğu şeyləri diləyən, onlara müxtəlif qurbanlar təqdim edən və müşriklərdən olan cahiliyyət əhlinin etdiyi işləri edən şəxsə gəldikdə isə, beləsinə şəhadət kəlməsi fayda verməyəcək.Üstəlik həmin şəxs şəhadəti gətirməkdə yalançıdır.Uca Allah buyurur: **"Münafiqlər sənin yanına gəldikləri zaman: Biz şəhadət veririk ki, sən Allahın Elçisisən!-deyirlər.Allah da bilir ki, sən Onun Elçisisən.Allaha şahiddir ki, münafiqlər əsl yalançılardır."**(əl-Munəfiqun:1) Əslində "lə iləhə illəllah" şəhadətinin mənası, Allaha ibadət etmək və Ondan qeyrisinə ibadəti tərk etməkdir.Ona ibadət etməyə təkəbbür göstərib Ona ibadət etməyən isə "lə iləhə illəllah" şəhadətini gətirmiş deyil.Allaha və Onunla yanaşı qeyrisinə ibadət edən şəxs həmçinin "lə iləhə illəllah" şəhadətini gətirmiş deyil." (əl-məsəil va-r-rasəil ən-nəcdiyyə:3/347)

Söhbəti çox uzatmadan bu məsələnin izahına başlayaq.

İlk öncə bu məsələ ilə əlaqədar olan bəzi qaydalar haqqında qısa söhbət açaq.

Birinci qayda: Hökm zahirə uyğun verilir.

Belə ki, insana veriləcək küfr yaxud iman hökmü onun zahirinə əsasən verilir.Əgər insan küfrü izhar edərsə ona küfr vəsfi şamil olunur.Əgər imanı izhar edərsə ona iman vəsfi şamil olunur və onun daxilində olan araşdırılmır.Çünki qəlblərdə olan haqqında bilgi qeybi bilən Allaha aiddir.

Şeyx ibn Useymin (rahiməhullah) "riyadu-s-salihin" kitabının şərhində demişdir: "Bil ki, dünyada mötəbər olan, zahirdə, dildə və bədən əzalarında olan işlərdir.Axirətdə isə mötəbər olan qəlbdə olan gizli işlərdir.Qiyamət günü insan, qəlbində olan işlərə

görə sorğu-suala çəkiləcək.Dünyada isə dili və bədən əzaları ilə etdiyi işlərə görə sorğu-sual ediləcək.Uca Allah buyurur: **“Şübhəsiz ki, Allah onu qaytarmağa qadirdir. Sirlərin sınaqdan keçiriləcəyi gün.”** (ət-Tariq:8-9) Qəlblərdə olan gizli işlər yoxlanılacaqdır.Habelə Uca Allah buyurur: **“Məgər o bilmir ki, qəbirlərdə olanlar çıxardılacağı və könslərdə olanlar aşkar ediləcəyi zaman məhz o gün Rəbbi onlardan xəbərdar olacaqdır?”** (əl-Adiyət:9-11)”. (şərhu riyadı-s-salihin, əl-mucəlləd səlis, bəbu icrail əhkəm alə-z-zahir va sərairuhum iləllahi təalə)

Bu qaydanın sabit olmasına dair bəzi dəlillər:

Uca Allah buyurur: **“Lakin əgər tövbə etsələr, namaz qılıb zəkat versələr, onları sərbəst buraxın.”** (ət-Təubə:5)

Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: “İnsanlar Allahdan başqa haqq məbudun olmadığına və Muhammədin Allahın elçisi olduğuna şahidlik etməyincə və namaz qılıb zəkat verməyincə onlara qarşı vuruşmaqla əmr olundum.Bunu edəcəkləri zaman məndən malları və qanlarını qorumuş olacaqlar. İslamın haqqı isə müstəsnadır.Onların sorğu-sualı isə Allaha aiddir.”(Buxari; kitəbul imən: 25)

Şeyxul-İslam ibn Teymiyyə (rahiməhullah) demişdir: “Mənası: Onlardan İslamın zahirini qəbul etməyə, onların daxilini isə Allaha həvalə etməyə əmr olundum.”

Habelə Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: “Kim bizim namazımızı qılar, qibləmizə yönələr və kəsdiyimiz əti yeyərsə, həmin insan müsəlmandır və Allahın və Peyğəmbərin himayəsi altındadır.” (Buxari)

Hədisdən bəlli olur ki, həmin zahiri əməlləri edən şəxsə müsəlman hökmü verilir və həmin şəxs Allahın və Peyğəmbərin himayəsinə girir.

Abdullah bin Utbə bin Məsud rəvayət edib demişdir: Ömər bin Xattabın (radıyəllahu anhu) belə dediyini eşitdim: "Peyğəmbərin (salləllahu aleyhi və səlləm) dönəmində insanlarla vəhyə əsasən rəftar olunurdu.Artıq vəhy kəsilmişdir.İndi isə biz yalnız sizin əməllərinizdən bizə aşkar olana uyğun sizinlə rəftar edəcəyik. Əgər biri bizə xeyiri izhar (aşkar) edərsə, ona arxayın olar və onu özümüzə yaxın bilərik.Onun qəlbində olan isə bizə aid deyil və qəlbində olana görə Allah Özü onu sorğu-suala çəkəcək.Əgər biri bizə yaramaz bir iş aşkar edərsə, daxilən yaxşı olduğunu desə belə ona arxayın olmarıq və onu təsdiq etmərik." (Buxari; kitəbu-ş-şəhədət:2641)

Şeyx ibn Useymin (rahiməhullah) bu əsərin şərhində demişdir: "Ömər (radıyəllahu anhu) demişdir: "Qəlbində pis bir niyyət tutarsa belə əgər biri bizə xeyiri izhar edərsə onun bizə izhar etdiyinə əsasən onunla rəftar edərik.Habelə gözəl niyyət tutarsa belə, əgər biri bizə yaramaz iş izhar edərsə biz həmin işə əsasən onunla rəftar edərik.Çünki biz, yalnız zahirə qiymət verməklə mükəlləfik.Bu, Uca Allahın bizə olan nemətidir.Biz yalnız zahirə hökm veririk.Çünki daxilə hökm vermək ağır işlərdən sayılır.Uca Allah isə heç bir şəxsə bacarmadığı işi yükləməz.Bu səbəbdən, əgər biri bizə xeyirli iş aşkar edərsə bizə aşkar etdiyi xeyirə əsasən onunla müamilə edərik.Habelə əgər biri pis iş aşkar edərsə, bizə aşkar etdiyi pis işə əsasən onunla müamilə edərik.Biz onun niyyətini araşdırmağa borclu deyilik. Niyyət isə, insan nəfsinin ona nəyi vəsvəsə etdiyini bilən aləmlərin Rəbbi Allaha aiddir." (şərhu

riyadı-s-salihin, əl-mucəlləd səlis, bəbu icrail əhkəm alə-z-zahir va sərairuhum iləllahi təalə)

Həmin rəvayət göstərir ki, səhabələr digər insanlara küfr yaxud iman hökmünü vermək məsələsində daxili kənara qoyub zahirə uyğun hökm vermək prinsipinə riayət edirdilər.

Sual oluna bilər: Əgər bir şəxs imana dəlalət edəcək bir işi, eyni zamanda küfrü aşkar edərsə, ona hansı hökm veriləcək?

Cavab: Əgər insan imana dəlalət edən bir işi, eyni zamanda küfrə və dindən çıxmağa dəlalət edən işi aşkar edərsə, küfrü və İslamı pozacaq işi tərk etməyincə ona küfr hökmü veriləcək.

Çünki əgər iman açıq-aydın küfrə qarışarsa, üstünlük və aşkarlıq küfrə aid ediləcək.Bu halda iman, sahibinə heç bir fayda verməyəcək.Çünki həmin insan iki ziddiyətli işi eyni anda edən şəxsə bənzəyir, Allaha və tağuta eyni zamanda ibadət edir.

Uca Allah buyurur: “**Onların çoxu yalnız şərik qoşaraq Allaha iman gətirir.”** (Yusuf:106) Onlar Rübubiyyət tövhidinə iman gətirir, Üluhiyyət tövhidində isə şərik qoşurlar.Onların imanı onlara heç bir fayda vermir.

Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: “İnsanın qəlbində iman ilə küfr yanaşı gəlməz.” (silsilətul əhadisi-s-sahiha: 1050) Burada təbii ki, böyük küfrdən söhbət gedir.

Ortaya növbəti sual çıxır: Məgər insanın şəhadəti dilə gətirməsi onun zahiri deyil?

Heç şübhəsiz ki, insanı İslam dininə daxil edən şəhadət kəlməsidir.Lakin alimlərin qeyd etdiyi kimi şəhadət kəlməsi İslama girmək üçün şərtdir.İnsanın İslamda davamiyyətli şəkildə qalması

üçün onun həmin kəlmənin tələblərinə əməl etməsi gərəkdir. Digər təbirlə desək, həmin kəlmənin tələb etdiyi əməlləri etməsi və həmin kəlməni pozan amillərdən uzaq durması gərəkdir.

İbn Rəcəb (rahiməhullah) demişdir: "Əgər insan şəhadəti iqrar edərsə hökm baxımından müsəlmana çevriləcək.İnsan bunu etməklə İslama daxil olacağı zaman İslamın digər tələblərini yerinə yetirməyə vadar ediləcək." (Cəmiul ulum vəl hikəm:1/228-230)

Şeyx Həmd bin Nasir bin Muammər (rahiməhullah) demişdir: "Alimlərimiz demişlər: Əgər kafir "Lə iləhə illəllah" kəlməsini deyərsə artıq qanını himayə edəcək dairəyə qədəm qoyacaq və onun rahat buraxılması vacib olacaq.Əgər bunu tamamlayarsa onun himayəsi gerçək mərhələyə qədəm qoyacaq, əks halda puça çıxacaq. Belə ki, Peyğəmbər (salləllahu aleyhi və sələm) hər hədisi ona münasib vaxtda söyləmişdir.O, demişdir: "İnsanlar Allahdan başqa haqq məbudun olmadığına şahidlik etməyincə mən onlara qarşı vuruşmaqla əmr olundum."[1] Müsəlmanlar bilməlidirlər ki, müsəlmanlarla savaşan kafir bu kəlməni deyəcəyi zaman rahat buraxılacaq və onun qanı və malı himayə altında olacaq.Daha sonra Peyğəmbər (salləllahu aleyhi və sələm) başqa bir hədisdə bəyan etmişdir ki, döyüş, iki şəhadətə və iki ibadətə qədər uzanır. O, demişdir: "İnsanlar Allahdan başqa haqq məbudun olmadığına və Muhamməedin Allahın elçisi olduğuna şahidlik etməyincə və namaz qılıb zəkat verməyincə onlara qarşı vuruşmaqla əmr olundum."[2] Adicə şəhadəti iqrar etməyin insanı davamiyyətli surətdə himayə etdiyinə dair şübhə yaranmasın deyə Peyğəmbər (salləllahu aleyhi və sələm) himayənin dolğunluğunun və

**[1] Yuxarıda qeyd edilib.**
**[2] Buxari:25.Muslim:22.İbn Ömər rəvayət etmişdir.**

kamilliyinin yalnız bununla əldə olunacağını bəyan etmişdir.Bəzi səhabələr bu şübhəyə düşdüyü zaman Əbu Bəkr (radıyəllahu anhu) həmin məsələni izah etmiş və nəticədə səhabələr bunu qəbul etmişlər. (əd-Duraru-s-səniyyə: 10/309-310)

Şeyx Abdur-Rəhman bin Həsən (rahiməhullah) demişdir: "Peyğəmbərin (salləllahu aleyhi və səlləm): "Allahdan savayı ibadət olunanları inkar etməlidir"[3],-sözü, böyük şərtdir və "Lə iləhə illəllah" kəlməsi yalnız onun (həmin şərtin) olacağı təqdirdə doğru olacaq.Əgər bu şərt olmazsa "Lə iləhə illəllah" kəlməsini deyənin qanı və malı himayə altında olmaz.Çünki "Lə iləhə illəllah" kəlməsinin mənası budur.İnsan həmin sözə dəlalət edən mənanı, şirki buraxmaq, ondan və onu edəndən uzaq durmaq kimi işləri həyata keçirtməsə həmin kəlmə ona fayda verməz. Əgər o, Allahdan savayı hər bir ibadət olunanı inkar edər, ondan uzaqlaşar və bunu edənlərə qarşı düşmən kəsilərsə qanı və malı himayə edilən musəlmana çevrilər.Uca Allahın kəlamı məhz bunu ifadə edir: **"Hər kəs tağutu inkar edib Allaha iman gətirərsə, heç vaxt qırılmayan ən möhkəm dəstəkdən yapışmış olar. Allah Eşidəndir, Biləndir."**[4]Artıq səhih hədislərdə "Lə iləhə illəllah" kəlməsi ağır şərtlərlə şərtlənmişdir. Onların hər birini, söz, etiqad və əməldə gerçəkləşdirmək gərəkdir." (əd-Duraru-s-səniyyə:2/243)

İkinci qayda: Adlar və əhkamlar.

Adlar və əhkamlar qaydası: Ad və hökm hüccətdən öncə ayrılır, hüccətdən sonra isə birləşir.

---

**[3] Muslim:23.Hədisi Tariq əl-Əşcai rəvayət etmişdir.Onun ləfzu belədir: Hər kim "lə iləhə illəllah" deyib Allahdan qeyri ibadət olunanı inkar edərsə onun malı və qanı haram olar.Onun sorğu-sualı isə Allaha aiddir.**

**[4]əl-Bəqərə::256.**

Belə ki, şirk edən şəxsin üzərindən hüccət qalxmayacağı və ona dəvət çatmayacağı zaman insan cəzaya məruz qalmasa belə hüccətin qalxmaması şəriətin qoyduğu şirk yaxud küfr yaxud fasiqlik adlarını dəyişmir.

Muşrik adı peyğəmbərin gəlişindən öncə də, sabit olur.Çünki həmin şəxs Rəbbinə şərik qoşur və qeyrilərini Ona tay tutur.

Şeyxul-İslam ibn Teymiyyə (rahiməhullah) müşrik adının risalətdən öncə sabit olduğunu isbat edərək demişdir: "Fəsil: Artıq Uca Allah risalətin gəlişindən öncə və sonra adlar və əhkamlar arasında fərq qoymuş, habelə ad və əhkamlar arasında cəm etmişdir.Bu isə iki tayfanın əleyhinə hüccətdir.Əməllərdə yaxşılıq və çirkinliyin olmadığını deyənlərin və iki görüşdən birinə əsasən onların əzaba layiq olduqlarını deyənlərin əleyhinə hüccətdir. Birinciyə gəldikdə, Uca Allah onları zalımlar, həddi aşanlar və fitnə-fəsad törədənlər adlandırmışdır.Uca Allah buyurur: **"Fironun yanına get! Çünki o, həddini aşmışdır."**(Tahə:24) Habelə buyurur: **"Bir zaman Rəbbin Musaya demişdi: Get o zalım gövmün, Firon xalqının yanına!"**(əş-Şuara:10-11) Habelə buyurur: **"Həqiqətən, Firon yer üzündə təkəbbürlük göstərib onun əhalisini zümrələrə bölmüşdü.Firon onlardan bir zümrəni zəiflədir, onların oğlan uşaqlarını öldürür, qadınlarını isə sağ buraxırdı.Həqiqətən, o, fitnə-fəsad törədənlərdən idi."**(əl-Qasas:4) Uca Allah onun və onun tayfasının zalım, həddini aşan və fitnə-fəsad törədən olduqlarını xəbər vermişdir. Bu adlar isə, əməlləri pisləmək üçün gəlmişdir. Məzəmmət isə yalnız pis və çirkin işlər üçün gəlir.Bu isə, insanlar üçün elçinin gəlişindən öncə də əməllərin çirkin və pislənən olacağına lakin həmin insanların onlara gələn elçidən sonra əzaba layiq olacaqlarına dəlalət edir. Uca Allah buyurur: **"Biz elçi göndərməmiş əzab verməik."**

Habelə Hud peyğəmbərin öz xalqına belə dediyini xəbər vermişdir: **“Allaha ibadət edin.Sizin Ondan başqa məbudunuz yoxdur.Siz ancaq iftira yaxanlarsınız.”**(Hud:50) Uca Allah ona müxalif olacaqları hökmü çıxarmamışdan öncə onları iftiraçı etmişdir. Çünki onlar Allahla yanaşı digər bir məbuda tapınmışlar.Bu səbəbdən, müşrik adı risalətdən öncə də, sabit olur.Belə ki, həmin şəxs, elçi gəlməmişdən öncə Rəbbinə şərik qoşur və Ona qeyrisini tay tutur, habelə Onunla yanaşı digər ilahlara tapınır.Bəlli olur ki, həmin adlar risalətdən öncə sabit olur.Habelə cahillik və cahiliyyət adı belədir.Belə ki, peyğəmbərin gəlişindən öncə də, cahiliyyət deyilir.Əzabın enməsi isə fərqlidir. Lakin itaətdən üz çevirmək peyğəmbərin gəlişindən sonra olur.Uca Allah buyurur: **“O, nə Quranı təsdiq etdi, nə də namaz qıldı.Haqqı da yalan saydı və üz döndərdi.”**(əl-Qiyamə: 31-32) Habelə buyurur: **“Musa ən böyük möcüzəni Firona göstərdi.O isə haqqı yalan sayıb üsyankar olduğunu göstərdi.”** (ən-Nizəat20-21)” (Məcmu` əl-fətəva:20/37-38)

Habelə Şeyxul-İslam ibn Teymiyyə (rahiməhullah) demişdir: “Allah haqqında cahil olmaq hər bir halda, xəbərin gəlişindən öncə və sonra küfrdür.” (Məcmu`əl-fətəva:7/325) Yəni, risalətin gəlişindən öncə, habelə hüccətin qalxmasından öncə və sonra sabit olur.

Habelə hüccətdən öncə və sonra sabit olan adlar və əhkamlar vardır:

Birinci: Hüccətin qalxması ilə əlaqəsi olmayan adlar.Həmin adlar, hüccət qalxmasa belə onu edənə şamil olunur: Şirk, iftira, qəflət, tüğyan, zülm, fəsad, təşəxxüs, zəlalət, əxlaqsızlıq, cahillik, dinsizlik, bidət, yəhudilik, nəsranilik v.s.

İkinci: Hüccət ilə əlaqəli olan adlar və yalnız hüccətin qalxmasından sonra hasil olan adlar: Təkzib, danma, itaət, asilik, üz çevirmə, imtina, təkəbbürlük, (bəzilərinə görə küfr) v.s.

Habelə hüccətin qalxması ilə əlaqəsi olmayan əhkamlar: Müamilə məsələləri: Şirk edən şəxsə bağışlanma diləməmək, kəsdiyini yeməmək, cənazəsini qılmamaq, müsəlmanların qəbiristanlığında dəfn etməmək, müsəlmanın ona varis olmaması v.s.

Habelə yalnız hüccətdən sonra olan əhkamlar: Əzaba düçar olma, qətlə yetirilmə, savaşa məruz qalma, axirət əhkamları, tövbəyə çağırılma v.s.

Belə ki, cahilliyin üzr olması məsələsi, insanların qarışıqlığa düşdükləri “adlar və əhkamlar” məsələləri növündən bir işdir.Çünki bu mövzuya baş vuran çoxları, üzr məsələsinə cəza və günah yönündən toxunmuş və bu üzdən həmin məsələni hüccətin qaldırılmasından öncə cəzanı inkar edən dəlillər çərçivəsində saxlamışlar.Onlar böyük şirk edən müsəlmanın üzürlü olub cəzalanmayacağı yaxud üzürsüz olub cəzalanacağı haqqında danışmışlar.

Lakin qeyd etmək lazımdır ki, alimlər küfr hökmünü şamil etdikləri zaman şirk adının şirk edən şəxsə aid ediləcəyibi qəsd edirlər.

Lakin alimlər küfr hökmünü verməkdən imtina etdikləri zaman hüccətdən öncə bu ad ilə bağlı olan dünyavi və axirət cəzasını inkar etməyi qəsd edirlər.

Çünki heç də, hər bir kafir əzaba məruz qalmır.Habelə hər kafir öldürülmür.

Habelə şər`i adlara dair qaydada deyilir: “Bir ad, onunla bağlı olan əhkamlar nisbətilə inkar və isbat edilir.Adın bir hökmdə sabit olacağı yaxud inkar ediləcəyi zaman bunun digər əhkamlarda belə olması vacib deyil.Bu, ərəblərin və digər xalqların kəlamında mövcuddur.” Bunu Şeyxul-İslam ibn Teymiyyə demiş və əzabı gərəkdirən küfr ilə əzabı gərəkdirməyən küfr arasında fərq qoymuşdur.

Hədis alimi şeyx Abdul-Əziz ət-Tarifi (hafizahullah) demişdir: “Məlum olduğu kimi, yer üzündə olan insanlar ya müsəlman ya da, kafirlərdir və onlardan qeyrisi yoxdur.Lakin bəzən insanlardan ad olaraq kafir olanlar mövcud olur lakin hökm olaraq kafir olmurlar.Belə ki, küfr işlərdən birinə düşən şəxs daxilən üzürlü olsa da, həmin şəxs etdiyi əməldə kafirlərə bənzədiyinə görə, ona hüccət və dəlil çatmış olmasa belə kafir olur.Bu səbəbdən, Uca Allah Qurani Kərimdə buyurur: **“Əgər müşriklərdən biri səndən aman diləsə, ona aman ver ki, Allahın sözünü eşitsin.”** Həmin şəxs Allahın kəlamını eşitməmişdən öncə Uca Allah onu müşrik adlandırmışdır.Bu şəxs zahirdə kafirlərin əməllərini etməklə onlara bənzəmişdir.Bununla belə, həmin şəxsin daxildə olan işi Allaha aiddir.Alimlər qatında bu məsələ “adlar və əhkamlar mövzusu” adlanır.Həmin şəxs zahirdə kafirlərə bənzəmiş, bu səbəbdən zahirdə onların adına layiq olmuşdur.Əhkamlar yönündən isə, həmin şəxsin işi Allaha aiddir.Əhkamlar dünya və axirət ilə əlaqəlidir.Məlumdur ki, adların həmçinin dünya və axirətdə iki məsələ ilə bağlılığı vardır.Bu səbəbdən, zahirdə küfr əməllərindən hər hansı bir şeyə düşən şəxs ad olaraq kafir olur, lakin onun üzərindən hüccət qalxmamış hökm olaraq kafir olmur.Bu səbəbdən, Uca Allah kafirlərə bənzəyən şəxslərə, üzürlü olsalar belə küfr və şirk hökmünü vermişdir.Buna görə Uca Allah

demişdir: "**"Əgər müşriklərdən biri səndən aman diləsə, ona aman ver ki, Allahın sözünü eşitsin."** Allahın kəlamını eşitməmişdən öncə onu müşrik adlandırmışdır.Habelə "əl-bəyyinə" surəsinin əvvəllərində Uca Allah bu cür şəxslərə küfr və şirk hökmünü verib demişdir: **"Kitab əhlindən və müşriklərdən inkar edənlər onlara açıq-aydın dəlil gəlməyincə küfrlərindən əl çəkmədilər."** Həmin şəxslərə isə öncə açıq-aydın dəlil gəlməmişdir." (şərhu kitəb mufidul mustəfid fi kufri təriki-t-təuhid:2-ci səh)

Həmin məsələ bilinəcəyi zaman, adlar və əhkamların iki qismdən ibarət olduğu bəlli olacaq:

Dünyavi adlar və əhkamlar: Zahirə əsasən qurulur.Bu məsələdə əsas, zahirin daxilə uyğun gəlməsidir.Məsələn İslam adının filan adama isbat edilməsidir.Lakin bəzən insan daxildə kafir olur və qəlbən imanı pozan amillərdən birinə sahib olur.Məhz bunun nəticəsində həmin şəxsə İslamın dünyavi hökmləri şamil olunur: Dostluq, dəstək, qanın, malın və namusun qorunması, habelə namazda imamlığın səhih olması, müsəlman qadınla evlənmək, ölünü yumaq, kəfənləmək, cənazə namazını qılmaq, müsəlmanlarla birgə dəfn etmək, miras, rəhmət oxumaq və digər əhkamlar.

Axirətlə bağlı olan adlar və əhkamlar: Müəyyən şəxsə dair yəqinliklə bilinən axirət adları yalnız axirətdə bilinir.Təbii ki, dəlil gələn yaxud icma bağlanan müəyyən şəxslər müstəsnadır.

Habelə bir şəxsin yəqin olaraq iman üzərə öldüyünü və onun cənnət əhlindən olduğunu söyləmək qeyri-mümkündür.Çünki küfrdən fərqli olaraq imanın səhih olması üçün daxilin zahirə uyğun gəlməsi şərtdir.Lakin bəzi alimlər istisna olaraq qeyd etmişlər ki, əgər insanlar bir şəxsin xeyir əhlindən olduğuna yekdil

olsalar, hədisdə gəldiyi kimi “vacib olar, vacib olar!”. Yəni, cənnət ona vacib olar.Bununla birgə günahkardan ötrü əzabın və cəhənnəm odunun olması qorxusu vardır.

Burada danışılan və qəsd edilən üzr məsələsi müəyyən əsaslar və qaydalar üzərində qurulmuşdur ki, ona da riayət etmək gərəkdir:

Birinci: Dünya əhkamları, İslam və küfr olaraq zahirə uyğun icra edilir.Əgər biri bizə İslamı izhar edərsə, ona müsəlman hökmü verilər.Lakin əgər biri küfr və şirki izhar edərsə ona kafir hökmü verilər.Bu, dünya əhkamlarında olur.

İkinci: Onun adı hüccətin qaldırılması ilə bağlı deyil.Çünki böyük şirkə düşən insan risalətdən öncə və sonra, habelə hüccətin qalxmasından öncə müşrik adlanır.

Üçüncü: Şirkə və küfrə düşən şəxsi müşrik adlandırmaq, həmin şəxsin cəzaya məruz qalacağını ifadə etmir.Çünki cəza yalnız hüccətin qalxmasından, habelə şərtlərin mövcud olub maneələrin aradan qalxmasından sonra və qazinin yaxud müsəlman hakimin önündə tövbəyə çağırılmasından sonra olur.Cəzanın tətbiqi hər bir şəxsə aid olan məsələ deyil.

Dördüncü: Şirkə düşən müəyyən şəxs şəriət zamanında olacağı təqdirdə hakimin hüzurunda tövbəyə çağırılacaq.Əgər tövbə edib qayıdarsa müsəlman sayılacaq və ondan şər`i cəza dəf ediləcək. Uca Allah tövbə edənin tövbəsini qəbul edir.Lakin əgər küfr və şirk kimi üzərində olduğu yolda israrla durarsa mürtəd, habelə həm zahirdə həm də, daxildə kafir olaraq öldürülər.Təbii ki, bu, şəriətin hökmü keçərli olan yerdə olur.

Şəriətin mövcud olmadığı yerdə aşkar küfrü və şirki edən şəxsə gəldikdə isə, həmin şəxs müşrik adlanır və ona zahirə əsasən küfr

və şirk əhkamları icra olunur.Onu tanıyan hər bir şəxs isə onunla müşrik və kafir müamiləsi aparır.Əgər həmin şəxs tövbə etmədən ölərsə, yalnız dünyada kafir olur.Axirətdə onun işi Allaha aiddir. Çünki həmin şəxs tövbəyə çağırılmamış və onun üzərindən cəzanı vacib edən hüccət qalxmamışdır.[5]Bu səbəbdən həmin şəxs həm zahirən həm də, daxilən, dünya və axirət etibarı ilə təkfir edilmir.[6] Lakin şəriətin mövcud olmadığı bir şəraitdə dünya əhkamlarında bizə aşkar etdiyi zahirə əsasən onunla müamilə edirik.Çünki şəriətin yoxluğu əhkamları qüvvədən salmır.

Beşinci: Cəza və əzab yalnız tövbəyə çağırılma və cəzanı gərəkli edən hüccətin qaldırılması, habelə şərtlərin mövcud olub maneələrin aradan qalxmasından sonra olur.Bu, dünyada cəzanın icrası üçündür.Axirətdə cəza isə yalnız xəbərin çatması, elçilər haqqında eşitmə, mütləq acizliyin aradan qalxması və risalət hüccətinin qaldırılmasından sonra olur.Uca Allah buyurur: **“Biz elçi göndərməmiş əzab verмərik.”** Cəza, yalnız elçilərin gəlişindən sonra olur.İnşəallah səhih və üstün görüş də, budur. Lakin ad, adicə felin hasil olması ilə sabit olur.Məlum olduğu kimi heç də hər bir kafir əzaba düçar olmur.Habelə heç də hər bir kafir qətlə yetirilmir.Belə ki, qiyamət günü fətra əhlindən olan insanlar sınağa çəkiləcəklər. Buna rəğmən şirk adı onlardan ayrılmazdır.Buna görə də, ad bir şeydir, cəza isə digər bir şeydir.Onların arasında fərq qoymamaq

---

**[5] Cəzanı vacib edən hüccət (əl-huccətul haddiyyə).Belə ki, hüccət iki növdür.**

**Birinci: Risalət hüccəti (əl-huccətu-r-risəliyyə): Risalət hüccəti Quranın çatması və Peyğəmbər haqqında eşitmə ilə qalxır.**

**İkinci: Cəzanı gərəkdirən hüccət (əl-huccətul haddiyyə): Müəyyən şəxs küfr olacaq əməl edəcəyi zaman tövbəyə çağırılma və qətlə yetirilmə zamanı hakimin yaxud qazinin qaldırdığı hüccətdir.Məlum olduğu kimi, həmin hüccəti yalnız imam qaldırır.**

**[6] Dünya və axirət etibarı ilə deyildikdə, həmin şəxsin dünyada cəzaya məruz qalmayacağı və axirətdə həmin şəxsin əzaba düçar olacağına dair qəti əminliyin yoxluğu qəsd edilir.**

yanlışlığa gətirib çıxarır.Burada həmin məsələyə məhz bu yöndən yanaşılır.Lakin çox təəssüf ki, müasir zamanda bu məsələ barədə danışan bir çoxları “adlar və əhkamlar” məsələsinə toxunmamış və bu məsələyə ad və cəza yönündən yanaşmamışlar.Lakin həmin şəxslər bu məsələyə yalnız cəza və günahın olması yönündən yaxınlaşmışlar.Əslində isə cəza, habelə tövbəyə çağırılma və hüccətin qaldırılması məsələsi şəriətlə hökm verilən yerlərə aiddir. Lakin ad məsələsində bütün bu işlərin olması şərt deyil.Belə ki, müəyyən şəxs küfrə və şirkə düşəcəyi zaman ona müşrik adı şamil ediləcək və öncə qeyd edildiyi kimi dünya əhkamları ilə axirət əhkamları arasında fərq qoyulacaq.

Altıncı: Böyük şirk edən şəxsin üzürlü olmadığı deyiləcəyi zaman həmin şəxsin yalnız adda üzürlü olmadığı qəsd ediləcək.Bu, yekdillik olan bir məsələdir və bu məsələdə ixtilaf yoxdur.Lakin bəzən insan cəza məsələsində üzürlü olur.Bu isə, həm dünyada həm də, axirətdə varid olur.

Yeddinci: Adlar məsələsi şirk və küfr işlərində hazırki durumda şəriətin tələbinə və Allahın hökmünə uyğun olaraq müamilə etməkdən ötrüdür.Bu, önəmli məsələdir.Lakin bəzi adamların iddia etdiyi kimi, tövhidə dəvəti və şirkdən çəkindirməyi tərk etməyi ifadə etmir.Əksinə, dəvət əsasdır.Çünki biz qazilər deyil dəvət edənlərik.Bu səbəbdən, müsəlmanın tövhidə çağırması və şirkdən çəkindirməsi labüddür.Əhli Sünnənin əsas təməli budur.

Lakin özlərini sələfin mənhəcinə nisbət edən bəzi insanlar ad və əhkamlar məsələsini inkar etmiş və bir insanın bu dünyada kafir axirətdə isə halı bəlli olmayan şəxs olduğunu təəccüblə qarşılamışlar.

Belə ki, dəvət imamlarından olmuş şeyx Abdul-lətif bin Abdur-Rahmən bin Həsən (rahiməhullah) "minhəcu-t-təsis" kitabında, insanın cəzaya məruz qalmayacağı deyildiyi zaman adın və gerçəyin inkar edildiyini düşünən[7] Nəcd dəvətinin düşmənlərindən biri olmuş iraqlı Davud bin Circisə rəddiyəsində demişdir: "İraqlı düşünür ki, şirk və küfr, habelə fasiqlik səciyyəsi öz gerçəyini tapmır və yalnız bunlardan birini edən şəxs cəhənnəm cəzasına məruz qalacağı zaman günah olur.Cəzanın hasil olmasına bir əngəl çıxacağı zaman isə ad və hökm aradan qalxır.Subhanəlləh! Bu insan necə də, həyasız, düşüncəsiz və gözü kordur.

Fərz edək ki, həmin şəxs cəzaya məruz qalmaz.Lakin onun haram olduğuna mane olan, onun səciyyəsini dəyişən və onu şirk adından döndərən nədir?!".(minhəcu-t-təsis:23-24-cü səh)

Habelə elmə mənsub olan bəzi şəxslər, alimlərin təsbit etdikləri adlar və hökmlər qaydasını rədd etmək üçün və batil məzhəblərini müdafiə etmək üçün elmsiz və düşüncəsiz halda demişlər: Siz deyirsiniz ki, böyük şirk edən şəxs üzürlü olacağı zaman hökm olaraq nə mömin, nə də ki, kafir olmayacaq və bu halda həmin şəxsin axirətdə əbədi cəhənnəmlik olduğu bəlli deyil.Bu söz, mötəzililərin beş əsasından birinə "iki məqam arasında olan məqam" etiqadına bənzəyir.Lakin sələf alimlərinin, ələxsus Nəcd alimlərinin qeyd etdiyi bu qayda ilə mötəzililərin dediyi söz arasında nə yaxından nə də, uzaqdan heç bir əlaqəsi yoxdur.

Belə ki, ilk öncə mötəzililərin dediyi iki məqam arasında olan məqam" etiqadı.

---

**[7] Yəni, üzürlü insan cəzaya məruz qalmadığı zaman şirk adı və gerçəyinin ondan inkar edildiyini düşünmüşdür.**

Qadı Abdul-Cəbbar demişdir: “Kəlam əhlinin istilahında onun tərifi: Böyük günah sahibinin iki ad arasında bir ada və iki hökm arasında bir hökmə sahib olduğunu bilməkdir.” (şərhul usulil xamsə:137-ci səh)

İbn Murtəda mötəzililərin icma etdikləri məsələni qeyd edib demişdir: “Mötəzililər “iki məqam arasında olan məqam” məsələsinə icma etmişlər.O isə, nə mömin nə də ki, kafir adlanmayan fasiqdir.” (əl-munyətu val əməl:6-cı səh)

İsfərayini demişdir: “Mötəzililərin yekdil olduqları rüsvayçı söz: Onlar deyirlər ki, fasiq müsəlman iki məqam arsında bir məqamda olur.Həmin şəxs onlara görə nə mömin, nə də ki, kafir deyil. Həmin şəxs tövbə etmədən dünyadan gedəcəyi zaman əbədi cəhənnəmlik olacaq.Uca Allahın onu bağışlaması və ona rəhm etməsi icazəli deyil.Yəni, böyük günah sahibi daxildə möminə bənzədiyi lakin əməlində ona bənzəmədiyi etibarı ilə, habelə əməldə kafirə bənzədiyi lakin daxildə ona bənzəmədiyi etibarı ilə bu ikisi arasında orta bir məqamda olur.Buna əsasən, həmin şəxsin əzabı kafirin əzabından bir qədər az olur.” (ət-təbsir fi-d-din:42-ci səh)

Bu nəqllər vasitəsilə mötəzililərin “iki məqam arasında olan məqam” deməklə nəyi qəsd etdikləri açıqca bəlli olur.

Onlar bu məqama böyük günah sahibini yerləşdirirlər.Onlara görə fasiq, ad və hökm olaraq nə mömin nə də ki, kafir deyil.Əslində həmin şəxs onlara görə iki məqam arasında bir məqamda olur.Həmin şəxs nə mömin nə də ki, kafir adlanmır.O, fasiq adlanır.

Habelə həmin şəxs iki hökm arasında olan bir hökmdə olur. Onun hökmü nə kafirlərin, nə də ki, möminlərin hökmündə deyil. Onun bu ikisi arasında bir hökmü vardır.Bu, dünyada olan adlar və hökmlərdir.Lakin axirətdə həmin şəxs əbədi cəhənnəmlik olacaq, lakin onun əzabı kafirin əzabından daha yüngün olacaq.

İndi isə Əhli Sünnədən olan alimlərin adlar və hökmlər məsələsinə dair etiqadı.Onlar böyük günah sahibinin kafir yaxud mömin olacağını müzakirə etməmişlər.Mötəzililərdən fərqli olaraq onlara görə böyük günah sahibi fasiq müsəlman sayılır.Əhli Sünnə alimləri böyük şirk edən şəxs haqqında danışmış və onun dünyada müşrik olacağını söyləmişlər və mötəzililər kimi onun nə kafir nə də, mömin olmadığını söyləməmişlər.Əhli Sünnənin alimləri cahilliyində üzürlü olub şirk edənin nə müsəlman nə də ki, kafir olduğunu dedikləri zaman axirət hökmü baxımından bunu ifadə etmişlər.Halbuki həmin şəxs dünyada müşrik sayılır.Habelə mötəzililər həmin məqamı dünyaya şamil edirlər.Axirətdə isə böyük günah sahibi əbədi cəhənnəmlikdir.Ancaq Əhli Sünnə alimləri, şirk edən şəxsin üzürlü olacağını dedikləri zaman onun axirətdə əbədi cəhənnəmlik olacağına qəti əminlik ifadə etməmiş və həmin insanların axirətdə sınağa çəkiləcəklərini söyləmişlər.Bəlli olur ki, bu iki məslək arasında heç bir bağlılıq və yaxınlıq yoxdur.

## Şirk edən şəxsin müşrik adlanması

### Təhqiq əhlindən olan alimlərin sözləri[8]

İnsana verilən hökmün zahirə uyğun olması bəlli olandan sonra, aydın olur ki, əgər bir şəxs şirk edərsə həmin şəxsə müşrik hökmü veriləcək.Həmin şəxsin özünü İslama nisbət etməsi isə qətiyyən gerçəyi dəyişmir.Məsələn, əgər bir şəxs zina edərsə, özünün iffətli olduğunu iddia etsə belə həmin şəxs zinakar adlanacaq və beləsi haqqında: Filankəsin əməli zinadır, lakin özü zinakar deyil,- deyilməyəcək.Habelə əgər biri oğurluq edərsə, ona oğru adı şamil olunacaq.Habelə əgər biri günahsız insanı qətlə yetirərsə, ona qatil adı şamil olunacaq v.s.

Qeyd edildiyi kimi təhqiq əhli bu məsələdə icma etmişlər və müəyyən şəxslərin və bəzi bidət əhlindən olan insanların bu məsələdə onlara müxalif olması həmin icmaya xələl gətirmir.Habelə Nəcd alimlərinin açıqladığı kimi "əməl küfrdür lakin əməli edən kafir deyil" sözü, qətiyyən böyük şirkə aid edilmir və alimlərin qeyd etdiyi kimi müsəlmanlara gizli qalan bəzi məsələlərə şamil olunur.Buna misal olaraq, alimlər deyirlər: Əgər biri "Quran məxluqdur" yaxud "Allah ərşə ucalmayıb" yaxud bidət əhlinin dedikləri digər küfr sözləri deyərsə, kafirdir.Lakin bu məsələlərdə şübhələrin və batil yozumların çoxluğu səbəbilə müəyyən şəxs həmin sözü dilə gətirəcəyi zaman dərhal təkfir olunmur və beləsinin üzərindən hüccət qaldırılmalıdır.

Lakin cahilliyin üzr olması məsələsi haqqında danışan əksər insanlar əsasən Şeyxul-İslam ibn Teymiyyənin və Muhamməd bin Abdul Vahhabın bu məsələyə dair görüşlərini qeyd edirlər.Əslində

---

**[8] Təhqiq əhli deyildikdə, tövhid və əqidə elmində imamlar olan şəxslər qəsd edilir.**

həmin alimlər bu məsələnin təhqiq əhli sırasında olan böyük imamlarıdır.Bu səbəbdən biz də, məsələnin izahına dair əsasən ibn Teymiyyənin və dəvət alimlərinin görüşlərini ortaya qoyub onların sözlərini insanlara yanlış təqdim edənlərin yanlışlığını bəyan edəcəyik.Habelə böyük müasir sələfi alimlərinin bu məsələyə dair kəlamları qeyd olunacaq.Üstəlik şeyx Fəuzanın bu məsələlərə dair görüşləri və sözləri xüsusi qeyd ediləcək.Habelə bu araşdırma vasitəsilə "təkfir" məsələsinin gerçək məfhumunu qismən də olsa aydınlaşdırmağa çalışacağıq.Müvəffəq edən Allahdır.O, bizə kifayət edər və O, necə də, gözəl havadardır!

İlk öncə qeyd etmək lazımdır ki, Şeyxul-İslam ibn Teymiyyənin kəlamlarını ən doğru və dəqiq anlayan alimlərin sözlərinə müraciət etmək labüddür.Heç şübhəsiz ki, Şeyxul-İslamın məzhəbini dərin araşdıran alimlər məhz onlardır.Söhbət dəvət alimlərindən gedir.Bu üzdən, Şeyxul-İslamın sözlərini anlamaq üçün dəvət alimlərinin sözlərinə müraciət etmək gərəkdir.Buna rəğmən Şeyxul-İslamın həmin məsələyə dair açıq-aydın sözləri mövcuddur.Beləliklə elm əhlinin və imamların sözləri:

Şeyxul-İslam ibn Teymiyyə (rahiməhullah)

Şeyxul-İslam ibn Teymiyyə əl-Hərrani (rahiməhullah) "Qaidətun azımə fil fərqi beynə ibədəti əhlil isləm val imən va ibədəti əhli-ş-şirki va-n-nifəq" kitabında İslama nisbət olunub qəbirlərə ibadət edən və onlardan yardım və digər şeylər diləyən şəxslər haqqında demişdir: "Onlardan bəziləri isə Allahdan istənilən şeyləri (oradakılardan) istəyərək namaz qılanın namazda Allaha dua etdiyi kimi; məni bağışla, mənə ruzi ver, mənə yardım et və bu kimi sözlər söyləyirlər.Halbuki, İslam dinini bilən şəxs bu kimi şeylərin bütün peyğəmbərlərin dininə zidd olduğuna və bunun, Allahın və Pey-

ğəmbərin haram etdiyi şirk olduğuna şübhə etmir.Üstəlik Allahın Elçisi (salləllahu aleyhi və səlləm) məhz həmin şirkə görə müşriklərə qarşı savaşmışdır.Həmin işləri edənlər cahillik səbəbilə üzürlü olmasaydılar və **“Biz elçi göndərməmiş əzab verməri̇k”[9]** ayəsində buyurulduğu kimi, peyğəmbər göndərilməyən insanlar kimi onların üzərindən hüccət qalxmasaydı, həmin insanlar onlar mislində olan müşriklər kimi dünya və axirət cəzasına layiq olardılar.Uca Allah buyurur: **“Bildiyiniz halda Allaha şəriklər qoşmayın!”.**[10] Habelə hədisdə gəlmişdir: “Bu ümmətdə olan şirk, qarışqanın yeriməsindən daha gizlidir.”

Elə isə, Peyğəmbərə iman gətirən şəxsə Peyğəmbərin gətirdiyi dinin həqiqəti bəlli olacağı və özünün müşrik olduğu ona bəlli olacağı zaman həmin şəxsin Allaha tövbə etməsi, İslamını təzələməsi və həmin şirkdən tövbə edərək İslama gəlməsi gərəkdir.”[11]

Şeyxul-İslamdan gələn həmin nəql vasitəsilə onun həmin məsələyə dair mövqeyi açıq-aydın bəlli olur və onun, şirk edənin cahilliyində üzürlü olduğunu dediyi zaman nəyi qəsd etməsi aydın olur.Belə ki, yuxarıda keçən sözlərdə ibn Teymiyyə Allahdan qeyrisinə dua edən bir çox insanların üzərindən hüccətin qalxmadığına görə onların cahillik səbəbilə üzürlü olduqlarını qeyd edir: “Həmin işləri edənlər cahillik səbəbilə üzürlü olmasaydılar və **“Biz elçi göndərməmiş əzab verməri̇k”[12]** ayəsində buyurulduğu kimi, peyğəmbər göndərilməyən insanlar kimi onların üzərindən hüccət qalxmasaydı”.Lakin bunun ardından üzr deyildiyi zaman həmin şəxslərin müsəlman olduqlarını qəsd etmədiyi bəlli olur və

---

**[9] əl-İsra:15.**
**[10] əl-Bəqərə:22.**
**[11] Qaidətun azımə fil fərqi beynə ibədəti əhlil islam val imən va ibədəti əhli-ş-şirki va-n-nifəq:70-ci səh.**
**[12] əl-İsra:15.**

üzr deyildikdə Allah qatında olan üzrdən söhbət gedir. Şeyxul-İslam deyir: "Elə isə, Peyğəmbərə iman gətirən şəxsə Peyğəmbərin gətirdiyi dinin həqiqəti bəlli olacağı və özünün müşrik olduğu ona bəlli olacağı zaman həmin şəxsin Allaha tövbə etməsi, İslamını təzələməsi və həmin şirkdən tövbə edərək İslama gəlməsi gərəkdir." Şeyxul-İslamın bu sözləri çox aydın olduğu səbəbilə artıq əlavə izaha lüzum qalmır.Lakin sözü qavramağa çətinlik çəkən bəzi insanlar üçün deyiləcək: Şeyxul-İslam burada Allaha və Peyğəmbərə iman edən lakin etdiyi əməlinin şirk olduğunu bilməyən və ardından hüccət çatandan sonra öncə özünün müşrik olduğunu anlayan şəxsin tövbə edib İslamını təzələməli olduğunu dilə gətirir.Yəni, Şeyxul-İslam hüccətdən öncə cahil olduğu zaman həmin şəxsin müşrik olaraq vəsf olunduğunu isbat edir.Bu, çox aydın məsələdir və Şeyxul-İslamdan cahilin üzürlü olduğuna dair sözlərini gətirib, güya Şeyxul-İslamın onları müsəlman gördüklərini isbat etməyə çalışan şəxlsərin sözündən tamamilə fərqlidir.

Şeyxul-İslam ibn Teymiyyə (rahiməhullah) şirk dualar haqqında söhbət əsnasında demişdir: "Bu məsələnin üç mərtəbəsi vardır: Birinci: Peyğəmbərlərdən yaxud saleh insanlardan yaxud qeyrisindən olmasına baxmayaraq ölü yaxud qaib olduğu halda Allahdan qeyrisinə dua edib: Ey filankəs ağam, mənə yardım et! Səndən kömək istəyirəm yaxud səndən mədəd diləyirəm yaxud düşmənin əleyhinə mənə zəfər ver v.s,-deyir.Allaha şərik qoşmaq məhz budur." Nəhayət bir qədər sonra demişdir: "Bundan daha acınacaqlı isə cahil müşriklərdən bir tayfanın dediyi kimi bir insanın: Məni bağışla və mənim tövbəmi qəbul et!-dəmələridir."[13]

**[13] Məcmu əl-fətəva:1/350-351.**

Diqqət yetir, Allahdan qeyrisinə dua edən həmin şəxsləri cahil müşriklər adlandırmışdır.Yəni, həmin şəxslərin üzərindən hüccətin qalxmamasına rəğmən həmin şəxslərə müşrik vəsfini isbat edir.

Şeyxul-İslam ibn Teymiyyə (rahiməhullah) qəbirə sitayiş edən bəzi müşriklərin etdiyi əməllər barəsində söhbət əsnasında demişdir: "Əgər sən: Bəzən ayrı-ayrı insanlar onun (yəni, Peyğəmbərin) qəbri yanında bu kimi əməllər edirlər,-desən, sənə cavab olaraq deyəcəm: Onun qəbrinə gəldikdə isə, bunu heç kim etmək gücündə deyil.Artıq Uca Allah onun duasını qəbul etmişdir: Allahım mənim qəbrimi ibadət olunan bütə çevirmə! Onun məscidinə gəldikdə isə, bunu yalnız bəzi cahil insanlar edirlər.İslam şəriətini bilən insan isə yalnız şəriətin icazə verdiyi əməlləri edir.Bunlar bacardıqca həmin insanlara qeyd olunan əməlləri qadağan edirlər. Bu üzdən ziyarətçilər zəlalət üzərə toplaşmırlar.Qeyrisinin qəbrinə gəldikdə isə, onun üçün səfərə çıxan bütün şəxslər cahil və azğın müşriklərdir.Onlar həmin qəbirlərə gəlir, orada isə onlara irad tutacaq heç bir kimsə olmur."[14]

Budur ey müsəlman! Şeyxul-İslam burada onları cahilliklə vəsf edir, daha sonra onlara zəlalət və şirk hökmünü verir.Eyni zamanda bu işlərdə onlara irad tutacaq şəxsin olmadığını qeyd edir.

Habelə Şeyxul-İslam ibn Teymiyyə (rahiməhullah) deyir: "Allahdan qeyrisinə dua edən və Allahdan qeyrisi üçün həccə çıxan şəxs həmçinin müşrikdir.Bunu edən şəxs kafir olur.Lakin bəzən insan bunun haram edilmiş şirk olduğunu bilmir.Belə ki, moğollar və qeyrilərindən olan bir çox insanlar İslama girmişlər. Bununla birgə onların öz bütləri vardır.Onlar həmin bütlərə ibadət edir və onu

---

[14] **Məcmu`əl-fətəva:27/269.**

təzim edir lakin bunun İslam dinində haram olduğunu bilmirlər. Onlar həmçinin oda sitayiş edir və bunun haram olduğunu bilmirlər.İslama girən bəzi insanlara şirkin bir çox növləri gizli qalır və onun şirk olduğunu bilmir.Beləsi azğın insandır və onun etdiyi şirk əməl batildir.Lakin hüccət qalxmayınca həmin şəxs cəzaya layiq olmur."[15]

Müşrikləri müdafiə edən bəzi cahil insanlar Şeyxul-İslamın bu sözlərini cahilliyin üzr olması məsələsinə dəlil gətirirlər.Əslində isə ibn Teymiyyənin həmin sözləri onların lehinə deyil əleyhinədir və onlar həmin sözlərin mənasını anlamamışlar.Şeyxul-İslamın bu sözləri açıq-aydın göstərir ki, o, burada həmin şəxslərin üzərindən hüccət qalxmayacağı zaman Allah qatında üzürlü olacaqlarını və cəzaya layiq olmayacaqlarını qeyd edir.Bununla birgə sözün əvvəlində həmin şəxsin müşrik olacağını vurğulayır. Habelə ibn Teymiyyə, həmin insanların şirkin haram olduğunu bilmədiklərini və onlardan bəzisinin cahillikdən bütlərə və hətta oda ibadət etdiklərini vurğulayır.Subhanəllah! Məgər kimsə düşünə bilərmi ki, Şeyxul-İslam oda sitayiş edən şəxsi yaxud bütə ibadət edən şəxsi müsəlman adlandırsın?!

Buna rəğmən həmin məsələdə çaşqınlıq içində olan bəzi qardaşlar, alimlərin kəlamlarını yarımçıq gətirən yaxud həmin sözləri yanlış yozan yaxud səhv anlayan bəzi dəvətçilərin əməyi nəticəsində Şeyxul-İslamın və digər alimlərin mövqeyində ziddiyətin olduğunu düşünür və həmin alimlərin bəzən cahilliyi üzr gördüklərini bəzən isə cahilliyi üzr görmədiklərini fikirləşir. Əslində isə məsələ onların anladığı kimi deyil və alimlərin sözlərində heç bir ziddiyət yoxdur. Məsələn bəzi insanlar, Şeyxul-İslamın qəbirlərə

---

**[15] ər-Raddu aləl-Əxnəi:206-cı səh.**

ibadət edən və ölülərə dua edən cahil müşrikləri müsəlman hesab etdiyini isbatlamaq arzusuyla ibn Teymiyyənin bəzi sözləri və fətvalarını dəlil gətirirlər.Həmin sözlərdə Şeyxul-İslam şirkə düşən və Allahdan qeyrisinə ibadət edən şəxsin yalnız hüccət qalxandan sonra təkfir ediləcəyini qeyd edir və buna cahilliyin geniş yayılmasını və şəriət elminin azlığını səbəb gətirir.Həmin sözlərdən birində Şeyxul-İslam deyir:

"Belə ki, biz Peyğəmbərin (salləllahu aleyhi və səlləm) gətirdiyi dini biləndən sonra qəti olaraq bilirik ki, o, ümmətinə peyğəmbərlərdən, saleh insanlardan yaxud qeyrisindən olan heç bir ölüyə, istər mədəd ifadəsi və başqa ifadə ilə, istərsə də pənah aparma ifadəsi və başqa ifadə ilə dua etməyi icazəli etməmişdir.Habelə o, öz ümmətinə ölüyə və qeyrisinə səcdə etməyi və bu kimi işləri icazəli etməmişdir.Üstəlik biz bilirik ki, o, bütün bu işləri qadağan etmişdir.Habelə həmin işlər Allahın və Peyğəmbərin haram etdikləri şirkdir.Lakin cahilliyin geniş yayılması və elmin azlığı səbəbilə, Peyğəmbərin gətirdiyi (din) onlara bəyan edilməyincə həmin şəxsləri təkfir etmək mümkün olmamışdır."[16]

Cavab olaraq deyiləcək:

Şeyxul-İslam ibn Teymiyyənin burada inkar etdiyi "küfr" əzabı gərəkdirən küfrdür.Şeyxul-İslam (rahiməhullah) "küfr" sözünü onunla əlaqəli hökmlərə uyğun olaraq müxtəlif mənalarda istifadə edir.

Habelə Muhamməd bin Abdul Vahhab (rahiməhullah) demişdir: "Şirk etməklə və müxtəlif məbudlara ibadət etməklə Peyğəmbərə asi olmaq elm çatandan sonra açıq-aydın küfrdür."

---

**[16] əl-İstiğasə:411-ci səh.**

İrca əhli bu və bu kimi sözləri eşitdikləri zaman sevincdən qanad açmağa hazır olurlar.Lakin bu zavallılar, ibn Teymiyyə və ibn əl-Qayyim və Muhammədd bin Abdul Vahhab kimi imamların sözlərində gələn mənalar haqqında qafildirlər.Həmin alimlər böyük şirk edənin yalnız hüccət qalxandan sonra təkfir ediləcəyini qeyd etdikləri zaman əzabı gərəkdirən təkfiri qəsd edir və məhz həmin küfrün hasil olduğunu inkar edirlər.Yəni, həm dünya həm də, axirətdə insanı əzaba düçar edəcək küfrdən söhbət gedir.Bununla birgə, həmin imamlar Allahdan qeyrisinə ibadət edən şəxsin, üzərindən hüccət qalxmasa belə müşrik olacağını qeyd edirlər.Beləsinin müsəlman olaraq vəsf edilməsi mümkün deyil.Çünki imam ibn əl-Qayyimin dediyi kimi: “İslam, Allahı təkləşdirmək və yalnız Ona ibadət etmək, habelə Allaha və Peyğəmbərə iman etmək və Peyğəmbərin gətirdiyinə tabe olmaqdır.İnsan bunu etməyəcəyi zaman müsəlman olmayacaq.İnsan inadkar kafir olmazsa, cahil kafir olacaq.”[17] Alimlərin və imamların İslama verdikləri bu tərif, müşrikləri və qəbirə tapınanları oradan xaric edir.

Hüccət qalxmamışdan öncə küfr sözünün çərçivəsi və hökmləri olur.Habelə hüccət qalxandan sonra onun digər çərçivəsi və hökmləri olur.Bu səbəbdən, alimlər bəzi hallarda hüccət qalxmayacağı zaman küfrün hasil olduğunu inkar edir, eyni zamanda böyük şirk edən şəxsə müşrik hökmünü verir və onun əzabı gərəkdirməyən küfr ilə müsəlmanların sırasından xaric olduğunu vurğulayırlar.

Şeyxul-İslam bu önəmli mənanı bəyan etdiyi əsnada demişdir: “Məsələnin məğzi, bir adın onunla əlaqəli hökmlərə uyğun olaraq

---

**[17] Tariqul hicrateyn:1/608.**

inkar və isbat edilməsidir.Onun bir hökmdə sabit olduğu yaxud inkar edildiyi zaman həmçinin digər hökmlərdə bu cür olması vacib deyil.Bu, ərəblərin və digər xalqların kəlamlarında rast gəlinir.Çünki məna anlaşılandır.

Buna misal: Bəzən münafiqlər bir yerdə möminlərdən edilir, digər yerdə isə onların möminlərdən olmadığı deyilir.Uca Allah buyurur: **“Şübhəsiz ki, Allah sizdən (cihada) mane olanları da, qardaşlarına: Bizə tərəf gəlin!-deyənləri də tanıyır.Döyüşə onların ancaq azı gələr.”** (əl-Əhzab:18)

Orada həmin münafiqləri düşməndən qorxan, cihaddan yayınan, digərlərini ondan çəkindirən və onlardan olan möminləri pisləyən etmişdir.Digər ayədə isə demişdir: **“Sizdən olmaya-olmaya mütləq sizdən olduqları barədə Allaha and içərlər.Lakin onlar qorxaq bir zümrədir.”** (ət-Təubə:56) Bunların günahı daha yüngüldür.Çünki onlar,çəkindirmək və acı dil ilə yamanlamaq kimi işlərlə möminlərə əziyyət verməmişlər.Lakin özlərinin daxilən, qəlbləri ilə möminlərdən olduqlarına dair Allaha and içmişlər. Ancaq Allah onların yalnız zahirdə möminlərdən olduqlarını bilmiş və onların sözünü təkzib etmişdir: “**Sizdən olmaya-olmaya”**.Öncəki ayədə isə demişdir: “**Allah sizdən (cihada) mane olanları da, qardaşlarına: Bizə tərəf gəlin!-deyənləri də tanıyır.”**

Bu ayədə müraciət, mömin olmadığı halda zahirdə müsəlman və mömin olana aid edilir.Çünki sizdən bu vəsfdə olanlar vardır. Beləsi mömin deyil.Üstəlik Allah onun əməlini puça çıxarmışdır.O, daxildə deyil zahirdə sizdəndir.

Bu səbəbdən, Peyğəmbərdən bəzi münafiqlərin qətlə yetirilməsi üçün izn alındığı zaman o, demişdir: “İnsanlar Muhamməddin öz

səhabələrini öldürdüyünü deməsinlər." Həmin insanlar, onların gerçək durumunu bilməyən insanlara görə zahirən Peyğəmbərin səhabələrindən olmuşlar.Onun gerçək səhabələri isə münafiqlikdən uzaq olmuşlar."

İbn Teymiyyə, ibn əl-Qayyim və Muhammməd ibn Abdul Vahhabın (rahiməhumullah) Allahdan qeyrisinə ibadət edən şəxsdən inkar etdikləri küfr, sahibini dünya və axirətdə cəzaya layiq edən küfrü ifadə edir.Dünyada qətlə yetirilməyi, axirətdə isə əbədi cəhənnəmə girməyi inkar etdikləri küfrdür.Bu isə yalnız hüccətin qalxmasından sonra baş verir.Uca Allah buyurur: **"Biz elçi göndərməmiş əzab vermərik."**[18]

İbn Teymiyyə (rahiməhullah) demişdir: "Kafirin halı risaləti təsəvvür etməsi yaxud etməməsindən kənar çıxmır.Əgər onu təsəvvür etmiş olmasa, bu, ona dair qəflətdə olduğundan və ona iman etməməsindən dolayı olacaq.Uca Allah buyurur: **"Bizi xatırlamaqdan qəlbini qafil etdiyimiz, nəfsinin istəklərinə uyan və işində ifrata varan bir kimsəyə itaət etmə!". (əl-Kəhf:18)** Habelə buyurur: **"Biz də ayələrimizi yalan hesab edib onlardan qafil olduqları üçün intiqam alaraq onları dənizdə batırdıq." (əl-Əraf:136)**

Lakin xalis qəflət yalnız risalət çatandan sonra olur.Əzabı gərəkdirən küfr isə yalnız risalətin çatmasından sonra olur.

Elçilərin gətirdiyini təkzib edən hər bir şəxs kafirdir.Lakin heç də hər bir kafir təkzib etmir.Bəzən, ona nəzər yetirəcəyi zaman şübhə edən yaxud ona nəzər yetirmədən ondan üz çevirən şəxslər olur. Bəzən isə ümumiyyətlə onu təsəvvür etməyən qafil olur.Lakin

**[18] əl-İsra:15.**

beləsinə gələcək cəza onun üçün göndərilən elçinin təbliğinə dayanır.” (Məcmu` əl-fətəva:2/80)

Həmin böyük imamın sözlərinə nəzər yetir! Şeyxul-İslam burada, kafirlərin növlərini sadalayıb, onlardan təkzib edənin, şübhə edənin və üz çevirənin olduğunu qeyd edir.Bu vəsflər isə yalnız hüccət çatandan sonra insana şamil olunur.Ardından bəzən ümumiyyətlə risaləti təsəvvür etməyən və qafil birisinin kafir olacağını qeyd edir.Lakin beləsinin üzərindən hüccət qalxmayınca həmin şəxsin cəzaya layiq olmayacağını vurğulayır.

Şeyxul-İslam Muhamməd ibn Abdul Vahhab (rahiməhullah)

Bir çox insanlar şeyx Muhammədin bəzi sözlərini dəlil gətirir və həmin sözləri yanlış yönə yönəltməyə çalışırlar.Lakin aşağıda şeyx Muhammədin qəbirlərə ibadət edən bəzi cahilləri təkfir etməməkdə nəyi qəsd etdiyini və onun heç bir ehtimal qəbul etməyən açıq-aydın kəlamlarını nəql edəcəyik.Habelə qeyd etmək lazımdır ki, şeyx Muhammədin kəlamlarını və bu məsələdə olan məzhəbini ən yaxşı bilən, heç şübhəsiz ki, onun övladları və şagirdləridir.Bu, təbii haldır.Çünki hər bir alimin sözlərini ən doğru və dəqiq bilən insanlar həmin alimlərin yaxın tələbələri və şagirdləri olur.İrəlidə onların şeyx Muhammədin sözlərinə izahatları qeyd olunacaq.

Şeyx Muhamməd bin Abdul Vahhab “əd-duraru-s-səniyyə” kitabında varid olan risalədə demişdir: “Cahiliyyət əhlindən İslama əməl edən və şirki tərk edən şəxs müsəlmandır.Lakin bu din (mübarək dəvəti qəsd edir) aşkar olmamışdan öncə müxtəlif məbudlara tapınan və bu hal üzərə ölən şəxsin zahiri küfrdür. Baxmayaraq ki, həmin şəxsin cahilliyi və onun diqqətinə çatdıran şəxsin yoxluğu səbəbilə onun üzərindən hüccətin qalxmadığı

ehtimalı vardır.Çünki biz zahirə görə hökm veririk.Daxilə hökm vermək isə Uca Allaha aiddir." (əd-duraru-s-səniyyə:10/33)

Habelə Şeyx Muhamməd bin Abdul Vahhab (rahiməhullah) demişdir: "Bu dəvət çatmamışdan öncə ölən şəxsə çıxarılacaq hökmə gəldikdə isə, həmin şəxs şirk etməklə və bu etiqadda olmaqla tanınıb həmin hal üzərə öləcəyi zaman beləsinin zahiri onun küfr üzərə ölməsidir. Həmin şəxs üçün dua edilməz, onun əvəzinə qurban kəsilməz və adından sədəqə verilməz."(əd-duraru-s-səniyyə:1/142)

Şeyx Muhamməd ibn Abdul Vahhabın yuxarıda keçən sözləri onun bu əzəmətli məsələyə dair gerçək məzhəbini çox aydın surətdə ortaya qoyur.Belə ki, şeyx cahillikdən dolayı və hüccət qalxmadığı səbəbilə şirk edən şəxslərin zahiri hallarının küfr olacağına hökm verir.Onun üzürlü olub olmaması məsələsi isə Allaha aiddir.

Şeyx Muhamməd ibn Abdul Vahhabdan nəql etdiyimiz sözlərə müxalif olması təəssüratını yaradan sözlər nəql edilir.Belə ki, şeyx Abdul Qadirin qəbiri, habelə Əhməd Bədəvinin qəbiri üzərində olan bütlərə və digərinə ibadət edən şəxslərin cahil olması və onların diqqətinə bunu çatdıran şəxsin olmaması səbəbilə küfrü inkar edir.

Əslində isə öncəki nəqldə göstərildiyi kimi burada cahilliyi səbəbilə üzürlü olan insanı cəzaya məruz qoyan küfr inkar edilir. Yəni, dünyada qətli yaxud axirətdə əzabı gərəkdirən küfr inkar edilir.Bu o demək deyil ki, şeyx onları müsəlman adlandırır.Xeyir, onlar cahil olsalar belə müşrik adlanırlar.Məsələyə daha çox aydınlıq gətirən sözlərdən birində şeyx Muhamməd bin Abdul Vahhab demişdir.

Beləliklə, şeyx Muhammməd bin Abdul Vahhab (rahiməhullah) İslama nisbət olunub qəbirlərə və övliyalara tapınan şəxslər haqqında söhbət əsnasında deyir: “Övliyalara və saleh insanlara ibadət edənlərdən olan həmin müşriklərə və beləlari mislində olanlara müşrik hökmü veririk.Onların üzərindən hüccət qalxacağı zaman isə onların kafir olacaqlarını hesab edirik.Dərəcə və ziyan baxımından ondan daha aşağı günahlar mislində bundan savayı olan günahdan ötrü isə təkfir etmirik.” (əd-duraru-s-səniyyə: 1/522)

Şeyx Muhammədin bu sözlərinə diqqətlə nəzər yetir! Şeyx burada müxtəlif məbudlara ibadət edənlərə müşrik hökmü verir: “Həmin müşriklərə və beləlari mislində olanlara müşrik hökmü veririk.” Şeyx Muhamməd İslama nisbət olunan həmin insanları hüccət çatmamışdan öncə müşrik adlandırır.Lakin cəzanın enəcəyini qeyd etmək və həmin şəxslərə həm zahiri həm də, daxili küfr hökmünü isbat etmək istədiyi zaman deyir: “Onların üzərindən hüccət qalxacağı zaman isə onların kafir olacaqlarını hesab edirik.” Bax, bəzi insanlar üçün qaranlıq qalan tərəfləri aradan qaldıran məqam məhz budur.Buradan şeyx Muhammədin, “təkfir etmirik” dedikdə nəyi qəsd etdiyi açıqca bəlli olur.Lakin bəzi insanlar öz məzhəbinə və nəfsi istəyinə uyğun gəlsin deyə şeyxin açıq-aydın məzhəbini tərk edib insanlara bir neçə ehtimal daşıyan sözləri təqdim edir və həmin sözlər vasitəsilə onlara nəyisə inandırmağa çalışırlar.Məgər ağıl sahibi üçün şeyx Muhamməd bin Abdul Vahhabın bu sözləri onun gerçək məzhəbini ortaya qoymaq üçün kifayət etmirmi?! Vallahul mustəan.

İndi isə, şeyxin övladları, nəvələri və şagirdlərindən olmuş Nəcd dəvətinin alimlərinin bu məsələyə dair məzhəbi təqdim olunur:

Şeyx Muhamməd bin Abdul-Vahhəbin övladlarına (Abdullah və Hüseyn), habelə Haməd bin Nəsir bin Muamməra (rahiməhu-mullah) sual verilmişdir: Allaha və Peyğəmbərə iman gətirən şəxs cahillikdən küfr söz yaxud əməl edəcəyi zaman hüccət qalxma-yınca sizin həmin şəxsi təkfir etməməyiniz bəlli olmuşdur. Əgər həmin hal üzərə olan şəxs bu dəvət ortaya çıxmamışdan öncə ölərsə yaxud öldürülərsə onlara qarşı mövqe necə olmalıdır?

Onlar cavab verib demişlər: İnsan cahilliyi üzündən yaxud diqqətinə çatdıran şəxs olmadığı üçün küfr olacaq söz yaxud əməl edəcəyi zaman üzərindən hüccət qalxmayınca ona küfr hökmünü verməyəcəyik.Lakin onun müsəlman olduğuna da, hökm verməyə-cəyik.Əksinə deyəcəyik: Onun bu əməli, malın və qanın toxunul-mazlığını aparan küfrdür.Lakin həmin şəxsin üzərindən hüccət qalxmadığı səbəbilə bu hökmü ona şamil etmirik.Habelə biz: Həmin şəxs kafir deyilsə deməli müsəlmandır,- demirik.Əksinə biz deyirik: Onun əməli kafirlərin əməlidir.Bu şəxsə müəyyən olaraq küfr hökmünü şamil etmək isə hüccətin çatmasına dayanır.Artıq elm əhli “fətra əhli”nə[19] dair, onların qiyamət günündə Arasat meydanında imtahan olunacaqlarını qeyd etmiş və onların hök-münü nə kafirlərin nə də ki, əməli-salehlərin hökmündə etmə-mişlər.” (əd-duraru-s-səniyyə:10/136)

---

**[19] Fətra əhli: Uzaq çöllükdə yaşaşdıqları yaxud haqqı bilməyə aciz olduqları və elmə yiyələnmək iqtidarında olmadıqları yaxud İslamdan və Peyğəmbərin gə-lişindən öncə öldükləri səbəbilə dəvətdən kənar qalan insanlardır.**

**Habelə Fətra əhli iki qismdir:**

**Birinci: Allaha heç bir şeyi şərik qoşmayaraq təkallahlıq üzərə ölən şəxslər.**

**İkinci: Şirk və küfr üzərə ölən müşriklər.Onlar iki növdür:**

**1)- Elm əldə etmək iqtidarında olub ondan üz döndərən və öz səhlənkarlığı nəti-cəsində elmdən məhrum olan.Beləsi üzürsüz və əzaba düçar olandır.**

**2)-Elm əldə etmək iqtidarında olmayıb aciz qalan şəxslər.Beləsi qiyamət günü imtahan olunacaq və sınağa çəkiləcək.**

**Habelə elm əldə etmək iqtidarında olmayan aciz insanlardan səy göstərənlər və üz çevirib öz durumlarından razı qalan insanlar vardır.**

Budur şeyx Muhamməd ibn Abdul Vahhabın alimlərdən olan iki oğlu və onun şagirdi Haməd bin Nəsir bu məsələyə dair çox aydın sözlər dilə gitirirlər.Belə ki, onlar üzərindən hüccət qalxmayan cahilin təkfir edilməyəcəyini qeyd etdikdən sonra belə həmin şəxsin müsəlman adlanmayacağını vurğulayırlar.Yəni, dünya əhkamlarında müsəlman olmadığını qeyd edirlər.Habelə bəzi savadsız insanların dediyi kimi bu sözün mötəzililərin sözləri qəbilindən olmadığını isbatlamaq üçün həmin şeyxlər fətra əhlini misal gətirirlər.Çünki bu məsələni baş-ayaq anlayan bəzi insanlar deyirlər ki, insan ya kafir olur ya da ki, müsəlman və insanın müşrik adlanması lakin axirətdə üzürlü olması mötəzililik təriqətində olan "iki məqam arasında məqam" əqidəsinə bənzəyir.Əslində isə məlum olduğu kimi "fətra əhli" alimlərin yekdilliyi ilə bu dünyada kafir hesab olunurlar.Lakin həmin insanlar axirətdə imtahan olunacaqlar.İmtahandan üzü ağ çıxan şəxslər cənnətə, digərləri isə cəhənnəmə düşəcəklər.Yəni, axirətdə həmin şəxslərin kafir olduğu deyilmir. Bu, səbəbdən "adlar və hökmlər" məfhumu şəriətdə öz təsdiqini tapmış məsələdir.

Şeyx Muhamməd bin Abdul-Vahhəbin övladları Abdullah və Hüseyn (rahiməhumullah) şeyxin dəvəti ortaya çıxmamışdan öncə ölənlərin hökmü barədə suala cavab verərkən demişlər: "Bu dəvət çatmamışdan öncə şirk əhlindən ölən şəxslərə çıxarılacaq hökmə gəldikdə, həmin şəxs şirk etməklə və bu etiqadda olmaqla tanınıb həmin hal üzərə öləcəyi zaman beləsinin zahiri onun küfr üzərə ölməsidir.Həmin şəxs üçün dua edilməz, onun əvəzinə qurban kəsilməz və adından sədəqə verilməz.Onun gerçək işi isə Uca Allaha aiddir.Əgər onun üzərindən sağ ikən hüccət qalxıbsa, bu həm zahirdə həm də, daxildə kafirdir.Əgər onun üzərindən sağ

ikən hüccət qalxmayıbsa, onun işi Allaha qalır." (əd-duraru-s-səniyyə:10/142)

Şeyxin övladları bu kimi şəxslərin müşrik olduqlarına hökm vermişlər.Axirətdə əzab isə yalnız risalətdən sonra olur.Habelə dəvət imamları burada zahiri və daxili küfr haqqında söz açırlar və bunun hüccət çatandan sonra öz təsdiqini tapacağını qeyd edirlər. Lakin hüccətdən öncə zahiri küfr hökmü sabit olur.

Şeyx Abdul-Lətif bin Abdur-Rahmən bin Həsən bin Muhamməd bin Abdul-Vahhəb (rahmətullahi aleyhi) zahiri məsələlərdə şeyx-lərinə təqlid edənlərin küfrünə dair ibn əl-Qayyimin sözlərini şərh edərkən demişdir: "Həqiqətən də, ibn əl-Qayyim, haqqı tələb etmək və bilmək imkanına malik olacaqları və buna səriştələri çatacaqları lakin üz çevirib əhəmiyyət verməyəcəkləri zaman küfr məsələlərdə şeyxlərinə təqlid edənlərin küfrünə əminlik ifadə etmişdir.Peyğəmbərlərin gətirdiyini bilməyə səriştəsi və imkanı çatmayan şəxs isə ona görə fətra əhlindən olan insanlar və Peyğəmbərin dəvəti çatmayan şəxslər mislindədir.Lakin beləsi, hətta onu təkfir etməyən şəxslərə görə müsəlman deyil." (fətəva-l-əimməti-n-nəcdiyyə:3/231)

Şeyx Abdul-Lətif Ali-ş-Şeyx (rahiməhullah) demişdir: "Onların ən aşağı durumları, peyğəmbərin gəlişindən öncə ölmüş və heç bir peyğəmbərin dəvətinə çatmamış fətra əhli mislində olmalarıdır."

Bir qədər sonra demişdir: "Hər iki növ insanlara müsəlman hökmü verilmir və hətta onlardan bəzisini təkfir etməyənlərə görə onlar müsəlman anlamına daxil deyillər.Şirk isə onlara uyğun gəlir və onun adı onları şamil edir.Özəyini və böyük əsasını, Lə iləhə illəllah şəhadətini pozmaqla birgə hansı İslam qala bilər ki?!". (minhəcu-t-təsis:97-98)

Şeyx Haməd bin Nəsir (rahiməhullah) demişdir: “Allahdan başqa məbudlara ibadət edib bu din (dəvət) ortaya çıxmamışdan öncə həmin hal üzərə ölən şəxsə gəldikdə, beləsinin cahil olması və diqqətinə çatdıracaq şəxsin olmaması səbəbilə üzərindən hüccətin qalxmadığı ehtimalı olacağı təqdirdə belə onun zahiri küfrdür. Çünki biz zahirə uyğun hökm veririk.İnsanın daxilinə hökm vermək isə Allaha aiddir.Uca Allah yalnız insanın üzərindən hüccəti qaldırdıqdan sonra hər hansı bir şəxsi əzaba düçar edir. Uca Allah buyurur**: “Biz elçi göndərməmiş əzab vermərik.”** Onlardan, durumu bəlli olmadığı halda ölən şəxslər haqqında isə bir söz söyləmirik və onlara nə kafir nə də ki, müsəlman hökmü vermirik.Ümumiyyətlə bizim öhdəmizə bu cür iş düşmür: **“Onlar bir ümmət idi ki, gəlib getdilər. Onların qazandıqları özlərinə, sizin qazandığınız isə sizə aiddir. Siz onların etdikləri barədə sorğu-suala tutulmayacaqsınız.”** (əd-duraru-s-səniyyə:97-98)

Habelə şeyx Haməd bin Muammər (rahiməhullah) “ər-raddu aləl quburiyyin” kitabında demişdir: “Ancaq halı, cahiliyyət əhlinin halı mislində olub Allahın Peyğəmbəri vasitəsilə göndərdiyi tövhidi və Allahın Peyğəmbəri vasitəsilə qadağan etdiyi şirki bilməyən şəxsə gəldikdə isə, bunun cahilliyi səbəbilə müsəlman olduğu deyilməz.Əksinə zahiri əməli şirk olan şəxsin zahiri küfrdür.Beləsi üçün bağışlanma istənməz və onun adından sədəqə çıxarılmaz.Onun işini isə gizlini sınağa çəkəcək və köksləлərdə olan gizlini bilən Allaha buraxırıq.Habelə biz demirik: Filankəs kafir olaraq ölmüşdür.Çünki biz müəyyən şəxs ilə qeyrisi arasında fərq qoyuruq.Habelə biz müəyyən şəxsə küfr hökmünü çıxartmırıq. Çünki biz onun daxili halının gerçəyini bilmirik.Biz bunu Allaha buraxır və ölüləri söymürük.Üstəlik biz deyirik: Onlar layiq olduqlarını almışlar.Əslində bu, Uca Allahın bizə əmr etdiyi dindən de-

yil.Bizi əmr edən, yalnız Allaha ibadət etməyə əmr edib Ona şərik qoşmamağı bizə əmr etmişdir.Biz Allahın Elçisinin (aleyhi-s-sələm) çağırdığına çağırdıqdan sonra bundan imtina edənə qarşı savaşırıq.Həmin şəxslər israr edəcəkləri zaman isə onları təkfir edir və onlara qarşı vuruşuruq." (ər-raddu aləl quburiyyin)

Şeyx Əbə Buteyn (rahiməhullah) "əl-məsəil va-r-rasəil" kitabında demişdir: "Fətra zamanında ölüb Peyğəmbərin dəvəti çatmamış şəxsin hökmünə gəldikdə isə, Uca Allah onların halını daha yaxşı bilir.Belə ki, "fətra" adı, hər hansı bir ümmət müstəsna edilib digər ümmətlə xüsusiləşmir.Artıq imam Əhməd zındıqlar və cəhmilər haqqında xütbəsində bunu demişdir: Hər dövrdə, elçilərin ardı-arası kəsildiyi bir zaman kəsiyində elm əhlindən olan insanlar edən Allaha həmd olsun.Habelə bu ifadə Ömərdən rəvayət olunur." (əl-məsəil va-r-rasəil:2/212-213)

Şeyx Əbə Buteynin bu kəlamlarını oxuyan görə bilər ki, şeyx fətra əhlini hər hansı bir ümmətlə xüsusiləşdirmir və bunu İslam dininnə mənsub olan insanlara həmçinin şamil edir.Habelə onların dəvətdən xəbərsiz olduqları səbəbilə onlara müsəlman hökmü də, vermir və onların halının Allaha aid olduğunu qeyd edir.

Şeyx Əbə Buteyn (rahiməhullah) demişdir: "Əgər böyük şirk edən cəhaləti səbəbilə üzürlü olsaydı, elə isə üzürlü olmayan kimdir?! Bu iddia, Uca Allahın yalnız inadkarın üzərində hüccətə sahib olduğunu gərəkdirir.Bununla bərabər bu iddianı irəli sürənin öz təməlini ümumiləşdirməsi mümkün deyil.Əksinə onun ziddiyətə düşməsi qaçılmazdır.Çünki onun Muhamməddin (salləllahu aleyhi və səlləm) risalətinə yaxud qiyamət gününə yaxud əqidənin digər əsaslarına dair şübhə edənin təkfirində dayanması mümkün deyil.Şübhə edən isə cahildir.Fəqihlər fiqh kitablarında

mürtədin hökmünü qeyd edib deyirlər: "İslama girdikdən sonra söz yaxud əməl yaxud şübhə yaxud etiqad ilə kafir olan müsəlman." Şübhənin səbəbi cahillikdir.Belə olan halda bizim cahil yəhudi və nəsraniləri, habelə cahillikləri üzündən günəşə, aya və bütlərə səcdə edənləri, habelə Əli bin Əbu Talibin odda yandırdığı şəxsləri təkfir etməməyimiz gərəkdir.Çünki biz qəti olaraq bilirik ki, onlar cahildirlər.Artıq müsəlmanlar, yəhudi və nəsranilərin və onların küfründə şübhə edənlərin küfrünə dair icma etmişlər.Biz onların çoxunun cahillər olduqlarını yəqin bilirik." (əd-duraru-s-səniyyə:11/230)

Şeyx Əbə Buteyn (rahiməhullah) demişdir: "Biz bilirik ki, İslama nisbət olunanlardan bunu (şirki) edən şəxsləri həmin əmələ yalnız cahillik salmışdır.Əgər onlar bunun onları Allahdan çox-çox uzaqlaşdırdığını və bunun Allahın haram etdiyi şirk olduğunu bilsəydilər onu etməzdilər.Lakin bəzi azmış şəxslərin: Bunlar üzürlüdürlər, çünki cahildirlər,-sözündən fərqli olaraq bütün alimlər onları təkfir etmiş və onları cahillik səbəbilə üzürlü etməmişlər."

Nəhayət demişdir: "Şeyxin sözünə gəldikdə isə (ibn Teymiyyə qəsd olunur): "Lakin bir çox sonraki insanlarda çahilliyin geniş yayılması səbəbilə onları təkfir etmək mümkün olmamışdır v.s." Şeyx burada onların üzürlü olduqlarını deməmiş və sadəcə bəyandan öncə onlara küfr sözünü şamil etmək məsələsində dayanmışdır.Onun sözü cəm edilərək deyiləcək: Onun burada qəsdi budur: Bir insanın küfr söz danışdığını eşidəcəyimiz yaxud bəzi insanların yazılarında ona rast gələcəyimiz zaman şəriətin hüccətini bəyan etməyincə, bunu etdiyini gördüyümüz yaxud eşitdiyimiz şəxsi təkfir etməyə tələsməyəcəyik.Lakin bununla birgə deyirik ki, qəbirlərə yaxud mələklərə yaxud qeyrilərinə dua edib

onlardan ehtiyacların təmin edilməsini istəyən həmin ifratçılar müşrik kafirlərdir.” (əd-duraru-s-səniyyə:10/401)

Şeyx Süleyman bin Abdullah bin Muhamməd bin Abdul Vahhab (rahiməhumullar) “lə iləhə illəllah” kəlməsinin mənasını izah etdiyi əsnada demişdir: “Buna dair gələn çoxsaylı ayələr “lə iləhə illəllah” kəlməsinin mənasını bəyan edir ki, həmin kəlmə, şəfaətçilər və şəriklər mislində olan Allahdan qeyrisinə ibadət etməkdən kənar durmağı və Allahı ibadətdə təkləşdirməyi ifadə edir. Doğru yol və həqiqi din məhz budur.Uca Allah peyğəmbərləri bu dinlə göndərmiş və kitabları ondan ötrü endirmişdir.Lakin insanın mənasını bilmədən və ona əməl etmədən “lə iləhə illəllah” kəlməsini deməsi yaxud tövhidi bilmədiyi halda özünün tövhid əhlindən olduğunu iddia etməsi, üstəlik bəzən dua, qorxu, qurban, nəzr, tövbə və ibadətin digər növlərindən olan hər hansı bir ibadəti Allahdan qeyrisinə yönəltməsi tövhidin hasil olması üçün kifayət etmir.Üstəlik həmin şəxs yalnız müşrik olur. Bu hal qəbirə sitayiş edənlərin durumu mislindədir.” (teysirul azizil hamid:110)

Şeyx Abdur-Rahmən bin Həsən (rahiməhullah) demişdir: “Alimlər-Allah onlara rəhmət eləsin-doğru üslub üzərə hərəkət edərək mürtədin hökmünə dair fəsil qeyd etmişlər.Onlardan heç biri isə deməmişdir ki, bir insan küfr sözün yaxud əməlin şəhadət kəlməsinə zidd gəldiyini bilməyəcəyi halda küfr söz yaxud əməl edəcəyi zaman cahilliyi səbəbilə kafir olmayacaq.Artıq Uca Allah Öz Kitabında bəyan etmişdir ki, bəzi müşriklər cahil təqlidçilər olmuşlar.Uca Allah isə onların cahil və təqlidçi olmalarını onların üzərindən cəzanı qaldırmaq üçün səbəb etməmişdir.” (əd-duraru-s-səniyyə:15/479-480)

Şeyx Abdur-Rahmən bin Həsən Ali-ş-Şeyx (rahiməhullah) demişdir: “Səhabələr, tabiinlər, imamlar və bütün Əhli sunnədən olan sələf və xələf icma etmişlər ki, insan yalnız böyük şirkdən azad olub ondan və onu edəndən uzaq durmaqla, habelə onlara nifrət bəsləyib onlara düşmənçilik etməklə müsəlman olur.” (əd-duraru-s-səniyyə:11/545-546)

Şeyx Süleyman bin Səhman ən-Nəcdi (rahiməhullah) Bəhreyn sakini Şərifə rəddiyə verdiyi risalədə özlərini İslama nisbət edən şirk əhli haqqında demişdir: “Bunu elm və din bilgisinə cuzi olaraq sahib olan şəxs bilir.Əslində (qəbirə sitayiş edənlərin) etdikləri şirkinə göz yumulsun və onların müsəlman və imana sahib olduqları söylənsin deyə namaz qıldıqları, oruc tutduqları və axirətə iman etdiklərinə görə qəbirə sitayiş edənləri müsəlman adlandırmaq, avam insanları çaşdırmaq və aldatmaqdan başqa bir şey deyil.Ancaq Allah, Peyğəmbər və möminlər bununla heç vaxt razılaşmaz.” (əd-duraru-s-səniyyə:12/536)

Budur şeyx Süleyman namaz qılan, oruc tutan və axirətə iman edən lakin eyni zamanda qəbirlərə tapınan şəxslərin müsəlman olmadıqlarını söyləyir.Lakin şeyx günümüzdə namaz qılmayan, oruc tutmayan, axirətə inanmayan və bunun boş şey olduğunu deyən şəxsləri müsəlman adlandıran insanları görsəydi, görəsən nə deyərdi?!

Nəcd dəvətinin alimlərindən gətirdiyimiz nəqllər vasitəsilə onların bu önəmli məsələdə mövqeyi və məzhəbi açıq-aydın surətdə bəlli olur.Onların bu məsələyə dair sözləri həddindən artıq çoxdur və həmin sözlərin hamısını burada qeyd etmək mümkün deyil.Lakin ağıl sahibi və doğru nəticə çıxaran şəxslər üçün qeyd edilənlər kifayətdir.

İndi isə keçirik Əhli Sünnənin müasir zamanda yaşamış və hal-hazırda da, aramızda olan böyük alimlərin bu məsələyə dair sözlərinə:

Möhtərəm şeyx Abdul-Əziz ibn Abdullah ibn Bəz (rahiməhullah)

Sual verən demişdir: Bəzi müsəlmanlar övliyaların zərər vermək, mənfəət cəlb etmək və bəlaları dəf etmək imkanına malik olduqlarını etiqad edirlər.Eyni zamanda onlar özlərini İslama nisbət edir, namaz qılır və qeyrisi kimi İslamın şüarlarını yerinə yetirirlər.Belə imamın arxasında namaz qılmaq səhihdirmi? Habelə onlar öləndən sonra onlar üçün bağışlanma diləmək olarmı?

Şeyx ibn Bəz (rahiməhullah) cavab olaraq demişdir: "Bu, ən çirkin sözlərdəndir.Bu, şirk və küfrdür.Çünki övliyalar ölü olacaqları zaman fayda və zərər vermir, habelə mənfəət cəlb etmir və zərəri dəf etmirlər.Təbii ki, onları övliya adlandırmaq doğru olacağı zaman.Çünki onlar ibadət və təqva ilə tanınırlar.Onlar fayda və zərər vermirlər.Fayda və zərər verən Bir olan Allahdır. Qullarına mənfəətlər cəlb edən, onlardan zərəri dəf edən məhz Odur.Uca Allah Öz Peyğəmbərinə buyurur: **"De: Mən Allahın istədiyindən başqa özümə nə bir fayda, nə də bir zərər yetirməyə qadir deyiləm."** (əl-Əraf:188)

Bir qədər sonra demişdir: "Elm sahibi hər kəs, Bədəvinin qəbri yaxud Hüseynin qəbri yaxud Musa Kazımın qəbri yaxud Abdul-Qadir Ceyləninin qəbri yanında və bu kimi yerlərdə, onlardan mədəd və yardım diləmək kimi edilən işləri bilir.Habelə onun küfr olduğunu və Allaha qoşulan şirk olduğunu bilir.Bundan həzər etmək və tövbə etmək, habelə bunu tərk etməyi tövsiyəsi etmək gərəkdir.Lakin belə şəxslərin arxasında namaz qılınmaz.Çünki onlar müşrikdirlər.Onların bu əməli isə böyük şirkdir.Onların

arxasında namaz qılınmaz və öldükləri zaman onlar üçün cənazə namazı qılınmaz.Çünki onlar, Peyğəmbərin (salləllahu aleyhi və səlləm) dönəmində Əbu Cəhl və onun kimi Məkkə kafirləri mislində olan cahiliyyət əhlinin etdiyi böyük şirki edirlər.” (fətəva nurun alə-d-dərb)

Şeyx ibn Bəzə (rahiməhullah) sual verilmişdir: Bir insan Peyğəmbərin təsir qüvvəsinə malik olduğunu və onun qeybi bildiyini, habelə istər ölülər, istərsə də, dirilər olsun övliyalar ilə təvəssül etməyin Allaha yaxınlaşdıran əməl olduğunu etiqad etdiyi halda ölərsə beləsi cəhənnəmə girəcək və müşrik hesab olunacaqmı? Habelə əgər insan bu əqidədən qeyrisini bilmirsə və həmin şəxs elə bir məntəqədə yaşayır ki, oranın bütün alimləri insanlara həmin etiqadı aşılayırlar.Belə olan halda onun hökmü nədir? Habelə onun adından sədəqə verməyin və ölümündən sonra ona xeyirxahlıq etməyin hökmü nədir?

Şeyx ibn Bəz cavab verir: “Bu etiqad üzərə ölən şəxs, yəni Muhamməding bəşər olmadığını və Adəm övladı olmadığını yaxud qeybi bildiyini etiqad etdiyi halda ölən şəxsin əqidəsi küfrdür. Habelə həmin şəxs kafir hesab olunur.Həmin insan, dua etməsi anlamında olan təvəssül edəcəyi, ondan yardım istəyəcəyi, ona nəzr edəcəyi zaman belə olacaq.Çünki təvəssül təfsilat tələb edən məsələdir.Bəzi insanlar təvəssül dedikdə, ölüyə dua etməyi, ondan yardım diləməyi qəsd edirlər.Bu, küfrdür.İnsan bu hal üzərə öləcəyi zaman küfr halı üzərə öləcək.Beləsinin adından sədəqə çıxarılmaz, ona cənazə namazı qılınmaz, onun meyyiti yuyulmaz və onun üçün dua edilməz.Axirətdə isə onun işi Allaha aiddir.Əgər həmin şəxs bunu cahilliyindən və elmsizliyindən edirsə və onu öyrədən şəxs yoxdursa, qiyamət günü onun hökmü “fətra əhli”nin hökmündə olacaq.Onlar imtahan olunub buyuruqlar alacaqlar.

Əgər onlar itaət etsələr cənnətə daxil olacaqlar.Əgər asi olsalar cəhənnəmə girəcəklər.Lakin əgər həmin şəxs bilir lakin səhlənkarlıq edir və əhəmiyyət vermirsə, beləsinin hökmü kafirlərin hökmündədir.Çünki həmin insan Uca Allahı təkzib etmiş olur.Uca Allah Peyğəmbərin bəşər olduğunu və onun qeybi bilmədiyini bəyan etmiş və onun ibadətə layiq olmadığını qeyd etmişdir.Muhammədin bəşər olmadığını və onun qeybi bildiyini etiqad edən şəxs, Allahı təkzib edib kafir olur.Allah qorusun! Lakin əgər cahil olarsa axirətdə onun işi Allaha aid olacaq.Dünyada isə onun hökmü kafirlərin hökmündə olacaq.Ona namaz qılınmayacaq, ona dua edilməyəcvək v.s." (fətəva nurun alə-d-dərb)

Şeyx ibn Bəzin sözləri elə açıq-aydındır ki, burada ümumiyyətlə əlavə heç bir izah verməyə lüzum qalmır.Bu sözləri anlamayan şəxslərin isə, bundan sonra nəyi anlayacaqları bəlli deyil.

Şeyx ibn Bəzə sual verilmişdir: Ölülərə dua etməyi icazəli görən şəxsin arxasında namaz qılmaq olarmı?

Şeyx ibn Bəz cavab olaraq deyir: "Ölülərə dua etməyi icazəli sayan müşrik olur.Ölüyə dua etməyi və ondan mədəd diləməyi icazəli sayan müşrik hesab olunur.Onun və onun əməlini edənlərin, habelə bu əməldən razı qalanların arxasında namaz qılınmır.Üstəlik bu, böyük şirkdir və Əbu Cəhlin və digər müşriklərin əməli mislində cahiliyyət əməlidir. Çünki Uca Allah buyurur: **"Allahdan başqa heç kəsə dua etməyin."** (əl-Cinn:18) Habelə Uca Allah buyurur: **"Allahı qoyub, sənə nə bir fayda, nə də bir zərər verə bilməyən şeylərə yalvarma.Əgər belə etsən, sözsüz ki, zalımlardan olarsan."**(Yunus:106) Yəni, müşriklərdən olarsan.Uca Alah buyurur: **"Bu sizin Rəbbiniz olan Allahdır. Mülk Onundur.Sizin Ondan başqa yalvardıqlarınız xurma**

**çəyirdəyinin pərdəsinə belə sahib deyillər.Əgər siz onları çağırsanız, onlar sizin duanızı eşitməzlər, eşitsələr də cavab verə bilməzlər.Özləri də qiyamət günü sizin şirkinizi danacaqlar.”** (Fatir:13-14) Həmin şəxslərin onlara dua etmələrini şirk adlandırmışdır.Habelə Uca Allah buyurur: **“Kim Allahla yanaşı, haqqında özünün heç bir dəlili olmadığı başqa bir məbuda ibadət edərsə, onun cəzasını Rəbbi Özü verəcəkdir.Şübhəsiz ki, kafirlər nicat tapmazlar!”** (əl-Muminun:117) Habelə bütlərə yaxud daşlara yaxud ağaclara yaxud cinlərə dua edən, onlardan yardım istəyən yaxud onlara nəzr edən şəxs müşrik adlanır.Ona cənazə namazı qılınmır, onun arxasında namaz qılınmır və dost tutulmur.Beləsinə Allah üçün nifrət etmək və Allah üçün ədavət bəsləmək gərəkdir.Eyni zamanda ona nəsihət etmək, anlatmaq və öyrətmək lazımdır.Ola bilsin ki, Uca Allah ona hidayət versin.” (fətəva nurun alə-d-dərb)

Şeyx ibn Bəzə sual verilmişdir: Qəsəbələrin birində məscid imamı vardır.Həmin şəxs günbəzləri ziyarət edir və orada olan ölülərdən mənfəət və müxtəlif şeylər istəyir.Habelə həmin şəxs məzarların üzərində olan daşlarla təbərrük edir.Onun arxasında namaz qılmaq olarmı.Əgər cavab mənfidirsə, belə olan təqdirdə biz nə etməliyik.Çünki orada başqa bir məscid yoxdur?

Şeyx ibn Bəz cavab verib demişdir: “İmamlıq şərtlərindən insanın müsəlman olmasıdır.Lakin alimlər ixtilaf etmişlər: İmamın ədalətli olması şərtdir yoxsa fasiqin arxasında həmçinin namaz qılmaq olar? Buna dair elm əhlinin iki görüşü vardır.Doğru görüş, müsəlman olacağı zaman fasiqin arxasında namazın səhih olmasıdır. Lakin qeyrisi olacağı zaman onu təyin etmək gərəkdir.Əmr sahiblərindən, ədalətli müsəlman, habelə etibarlı, xeyirxah və insanlara örnək olacaq imam təyin etmək tələb olunur.

Qəbirləri ziyarət edən və Allahı buraxıb orada olan ölülərə dua edən, onlardan yardım istəyən, qəbirlərinə sürtünən, onlardan xəstələrə şəfa verməyi istəyən və düşmənlərə qarşı zəfər verməyi diləyən şəxsə gəldikdə isə, beləsi müsəlman deyil müşrikdir.Çünki ölülərə dua etmək, onlardan yardım istəmək, onlara nəzr etmək böyük küfrün növlərindəndir.Beləsinin imam edilməsi və onun arxasında namaz qılmaq olmaz.

Müsəlmanlar başqa məscid tapa bilməyəcəkləri zaman isə ondan öncə yaxud sonra qılacaqlar.Orada qəbr olmayacağı zaman onun namaz qıldığı məsciddə ondan əvvəl yaxud sonra namaz qılacaqlar.Əgər onu kənarlaşdırmaq mümkün olarsa bunu etmək vacib olacaq.Əgər bunu etmək mümkün olmazsa müsəlmanlar gözləyəcək və onun ardından namaz qılacaq yaxud ondan öncə qılacaqlar. Namazın vaxtı girəcəyi zaman imkan olacağı halda ondan öncə qılacaqlar.Əgər bunu etmək mümkün olmazsa öz evlərində qılacaqlar.Uca Allah buyurur: **“Allahdan bacardığınız qədər qorxun.”** (ət-Təğabun:16)” (fətəva nurun alə-d-dərb)

Şeyx ibn Bəzə sual verilmişdir: “Biz keçmiş sovet işğalı altında olmuş İslam cumhuriyyətlərindən birinə səfər etdik.İnsanların orada yalnız şəhadət kəlməsini dediklərini gördük.Onlar namazın vacib olduğunu, zəkatın, orucun və digər şər`i buyuruqların vacib olduğunu bilmirlər.Onların çoxu namaz qılmır və oruc tutmurlar.

Sual: Onları müsəlman hesab etmək olarmı? Yəni, onlara salam vermək, onların kəsdikləri əti yemək, onlarla evlənmək və onların ölənlərinə cənazı namazı qılmaq olarmı?

Şeyx ibn Bəz (rahiməhullah) demişdir: “Onlara nəsihət vermək, xeyirə bələdçilik etmək və Allaha dəvət etmək, habelə cahil olduqları şeyləri onlara anlatmaq gərəkdir.Bu, Bosniyə və digər yerlər-

də dəvətçilərin vəzifəsidir.Onlar insanları öyrətməli və Allaha çağırmalı, habelə Allahın buyurduğu işləri onlara xəbər verib xeyirə bələdçilik etməlidirlər.

Lakin əgər onlar namaz qılmırlarsa yaxud şirk edirlərsə onların kəsdikləri əti yemək halal deyil.Əgər onlar bundan tövbə etsələr, bunu etməkdə heç bir qəbahət olmaz.Lakin madam ki, onlar namaz qılmırlar yaxud şirk əməllər edirlərsə onların kəsdikləri ət yeyilmir.Lakin onlara öyrətmək və nəsihət etmək lazımdır.Əgər onlar tövbə edib Allaha tərəf qayıtsalar onların kəsdikləri yeyilər və onlar bizim din qardaşlarımız olarlar." (əsbəbu-s-səbat əməmə əl-fitən, adlı mühazirənin sual-cavabları)

Şeyx ibn Bəzə sual verilmişdir: Bir çox insanlar tövhidə zidd olan işlərə düşürlər.Onların hökmü nədir? Onlar cahillik səbəbilə üzürlü olurlarmı? Onlarla evlənmək və onların kəsdiyini yemək olarmı? Onların Məkkəyə girməsi icazəlidirmi?

Şeyx ibn Bəz (rahiməhullah) cavab verib demişdir: "Əgər biri ölülərə dua etmək, onlardan yardım istəmək və onlara nəzr etmək və ibadətin digər növlərini onlara yönəltmək kimi işlərlə tanınarsa, beləsi müşrik və kafirdir.Həmin insan etdiyi şirkdən Allaha tövbə etməyincə cahil olduğunu iddia edərsə belə onunla evlənmək və onun Məscidul-Harama girməsi və onunla müsəlman müamiləsi aparmaq icazəli deyil.Uca Allah buyurur: **"Müşrik qadınlar iman gətirməyincə onlarla evlənməyin.Əlbəttə, iman gətirmiş bir kəniz, sizi heyran edən müşrik bir qadından daha xeyirlidir.Müşrik kişilər iman gətirməyincə mömin qadınları onlara ərə verməyin.Əlbəttə, iman gətirmiş bir kölə, sizi heyran edən müşrik bir kişidən daha xeyirlidir."** (əl-Bəqərə:221) Habelə Uca Allah buyurur: **"Ey iman gətirənlər!**

**Mömin qadınlar hicrət edib sizin yanınıza gəldikləri zaman onları imtahana çəkin.Allah onların imanını daha yaxşı bilir. Əgər bunların mömin olduqlarını bilsəniz, onları kafirlərə qaytarmayın. Nə bunlar onlara, nə də onlar bunlara halaldır.”** (əl-Mumtəhənə:10) Habelə Uca Allah buyurur: **“Ey iman gətirən-lər! Həqiqətən də, müşriklər murdardırlar.Odur ki, özlərinin bu ilindən sonra Məscidul-Hərama yaxınlaşmasınlar.”** (ət-Təubə: 28) Həmin şəxslərin cahil olmalarına əhəmiyyət verilməz və onlar bu əməllərindən Allaha tövbə etməyincə onlarla kafir-lərin müamiləsini (kafirə göstərilən münasibəti) aparmaq vacib-dir.” (tuhfə-tul ixvan biəcvibətin muhimmə bi-ərkənil isləm:37-ci səh)

Şeyx ibn Bəzin (rahiməhullah) şərh etdiyi “kəşfu-ş-şubuhat” kita-bının sual-cavablar qismində gəlmişdir:

Sual: Qurban kəsməyin və nəzr etməyin ibadət olduğunu bil-məyən şəxsin hökmü nədir?

Cavab: Cahil öyrədilir.Bilməyən şəxsə başa salınır.

Sual: Beləsinə şirk hökmü çıxarılırmı?

Cavab: Ona şirk hökmü çıxarılır və başa salınır.Məgər Uca Allahın bu ayəsini eşitməmisən: **“Yoxsa elə hesab edirsən ki, onların əksəriyyəti eşidəcək və ya anlayacaq?”.**(əl-Furqan:44) Heyvan-lar anlayırmı? **“Onlar heyvan kimidirlər, hətta, haqq yoldan daha çox uzaqlaşmışlar.”**(əl-Furqan:44) Habelə Uca Allah buyu-rur: “**Biz cəhənnəm üçün bir çox cinlər və insanlar yaratdıq. Onların qəlbləri var, onunla anlamazlar; gözləri var, onunla görməzlər; qulaqları var, onunla eşitməzlər.Onlar heyvan kimidirlər, hətta daha çox azğınlıqdadırlar.Qafil olanlar da**

**məhz onlardır."**(əl-Əraf:179) Onlara bundan daha böyük danlaq ola bilərmi?! Allah qorusun!". (şərhu kəşfi-ş-şubuhat)

Elmi araşdırmalar və fətvalar üzrə daimi komitə (əl-ləcnə əd-dəimə) fətva çıxarmışdır:

"Peyğəmbərimiz Muhammədin (salləllahu aleyhi və səlləm) risalətinə və şəriətdən gətirdiyi digər şeylərə iman edən hər bir şəxs bunun ardından qəbirdə olan ölü yaxud təriqət şeyxi kimi Allahdan qeyrisinə səcdə edəcəyi zaman kafir, İslamdan çıxmış mürtəd və ibadətdə Allaha şərik qoşan müşrik hesab olunacaq. Həmin şəxsin səcdə etdiyi zaman şəhadət kəlməsini dilə gətirməsi faydasızdır.Çünki həmin şəxs Allahdan qeyrisinə səcdə etməklə həmin kəlməni pozur.Lakin bəzən insan cahilliyi səbəbilə üzürlü olur və onun üzərindən hüccət qaldırılmayınca və üzr olaraq özünə qayıdıb tövbə ötməsi ümidi ilə ona üç gün möhlət verilməyincə həmin şəxsə buna görə cəza gəlmir.Əgər həmin şəxs bəyan ediləndən sonra Allahdan qeyrisinə səcdə etməkdə israrla durarsa mürtəd olduğu üçün öldürülər.Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: "Dinini dəyişəni öldürün!". Bəyan etmək və hüccəti qaldırmaq, onun bəyandan sonra kafir adlandırılması üçün deyil və sadəcə cəzanı endirməkdən öncə üzürü aradan götürməkdən ötrüdür.Çünki həmin şəxs Allahdan qeyrisinə səcdə etmək yaxud nəzr etmək yaxud qurban kəsmək kimi etdiyi əməl ilə artıq kafir adlanır.Artıq Quran və Sünnə şirk üzərə ölən şəxsin bağışlanmayacağına və əbədi cəhənnəmlik olacağına dəlalət etmişdir: **"Şübhəsiz ki, Allah Özünə şərik qoşulmasını bağışlamaz, bundan başqa daha kiçik günahları isə istədiyi kimsəyə bağışlayar."** (ən-Nisə:48) Habelə buyurur: **"Müşriklər küfr etdiklərini bildikləri halda, onlara Allahın məscidlərini abadlaşdırmaq yaramaz.Onların əməlləri puça çıxmışdır. Onlar odda**

**əbədi qalacaqlar."** (ət-Təubə:17) (daimi komitə: üzv: Abdullah bin Qaud.Başçı müavini: Abdur-Razzəq Afifi.Komitənin başçısı: Abdul-Əziz bin Abdullah bin Bəz.Birinci cild, 334-cü səh, ikinci sual, fətva:4400)

<u>Şeyx Salih Alu-ş-Şeyx</u> (hafizahullah)

Şeyx demişdir: "Belə şəxsə şirk ifadəsini, habelə küfr ifadəsini işlətməkdən imtina etmirik.Çünki madam ki, həmin şəxs Allaha şərik qoşur və şirk edir, ona müşrik və kafir adı şamil olunur.Lakin ona şamil olunan şirk, onun malını və qanını halal etmir.Əslində bu, bəyan və dəvətə dayanır.Bundan öncə bəyan və dəvət etmək labüddür.Lakin hökm olaraq, ona müşrik hökmü çıxarılır və dünyada ona kafirlərin əhkamları tətbiq edilir.Lakin həmin şəxsə axirətdə kafir olanların əhkamlarına şahidlik edilmir.Yəni, həmin şəxsin cəhənnəm əhli olduğuna şahidlik edilmir.Çünki biz, elm əhli tərəfindən qalxan hüccətdən və bəyandan sonra onun şəriətin hüccətini rədd etməsini yaxud küfr bayrağı altında savaşdığını bilmirik." (şərhu məsəilil cəhiliyyə, birinci məsələnin şərhi)

Şeyx Salih (hafizahullah) demişdir: "Hüccət qalxmayacağı zaman qəbirə ibadət edənlər təkfir olunacaq yoxsa yox? Bunun cavabı: Bəli! Kim böyük şirk edərsə, müşrik olar.Qəbirlərə və bu kimi şeylərə ibadət edən bütbərəstlər həmçinin, şirk edəcəkləri zaman müşrik olacaqlar və onlara dünyada müşriklərin əhkamları tətbiq olunacaq.Lakin insanın üzərindən hüccət qalxmayacağı zaman həmin şəxs öldükdə onun cəhənnəm əhlindən olması qətiyyətlə deyilməyəcək.Çünki bu məsələ, Allah qarşısında onun üzərindən hüccətin qaldırılmasına dayanır.

Beləliklə məlum olur ki, bizim hüccəti şərt qoymağımız ilə şirk hökmünü verməkdən imtina etmək arasında fərq vardır.Çünki

əgər biri böyük şirk edərsə müşrik olar və bunun nəticəsində onunla dünyada bu cür rəftar edilər.Həmin şəxs üçün bağışlanma dilənməz, onun kəsdiyi ət yeyilməz, onun üçün qurban kəsilməz və digər əhkamlar.Ona həm zahiri həm də, daxili küfr hökmünü vermək isə onun üzərindən hüccətin qalxması amilinə dayanır. Onun üzərindən hüccət qalxmayacağı zaman isə onun işi Allaha aid olacaq." (şərhu məsəilil cəhiliyyə, dördüncü səsli yazı)

Şeyx Salih Alu-ş-Şeyxdən (hafizahullah) gələn bu iki nəql qərəzli insanların şübhələrini ifşa etmək üçün ən qüvvətli sözlərdən sayılır.Belə ki, şeyx Salihin sözlərindən növbəti məsələlər aydınlaşır:

Birinci: Şirk edən şəxsin üzərindən hüccət qalxmasa belə onun müşrik adlanması sabit olur.

İkinci: Hüccət və bəyandan öncə onun zahirinə uyğun verilən şirk hökmü onun qanı və malını halal etmir.Bu isə, bəzi qərəzli insanların və saxtakarların qardaşlara atdığı iftiranı puç edir.Çünki həmin saxtakarlar iddia edirlər ki, əgər bir insan digərinə müşrik deyərsə artıq onun qanını, malını və namusunu halal etmiş olacaq. Bununla da, həmin şəxslər, bilərəkdən yaxud cahillikdən insanları Allahın dinindən və gerçək tövhiddən uzaqlaşdırır və müsəlmanları onların demədiyi və etmədiyi işlərdə əsassız ittiham edirlər. Şikayətimiz Allahadır!

Üçüncü: Cahillikdən şirk edən şəxslərə dünyada müşriklərin əhkamları tətbiq olunur.Onlar üçün bağışlanma dilənmir, onların kəsdikləri ət yeyilmir v.s.

Dördüncü: Hüccətin qalxması insana həm zahiri həm də, daxili küfr hökmünü vermək üçündür.Yəni, insanın müşrik olduğuna və

onun bu hal üzərə öləcəyi zaman cəhənnəmlik olacağına verilən hökm.Ancaq yalnız zahiri küfr hökmü, hüccətin qalxması amilinə dayanmır.

Habelə şeyx Salih Alu-ş-Şeyx (hafizahullah) bu məsələyə dair çox mətanətli sözlər söyləmişdir.Şeyx "kəşfu-ş-şubuhat" kitabının şər-hində bəzi insanların imam, mucəddid Muhamməd bin Abdul Vahhabın bütün hallarda cahilliyi üzr gördüyünü deyən və şeyxin bu məsələyə dair qeyd etdiyi və qərarlaşdırdığı açıq-aydın kəlam-larını diqqətsiz qoyan bəzi müasirlərin istinad etdikləri nöqtələri izah edərək demişdir: "Bəzən küfr üz çevirmə və cahillik yönün-dən olur.Bəzən isə təkəbbürlük və imtina cəhətindən olur. Bəzən isə mövcud durum yönündən olur, yəni insanlara verilən hökm. Çünki şirk edən şəxsə, həmin şəxsin bilməsindən yaxud cahil ol-masından asılı olmayaraq müşrik deyilir.Ona verilən küfr hökmü müxtəlif növlüdür.Belə ki, əgər onun üzərindən, şübhəni kənar etmək və Allahın Peyğəmbərinə nazil etdiyi hüdüdları, tövhidi və şirki anlatmaq üçün bilikli insan tərəfindən hüccət qaldırılarsa, həmin şəxs isə hüccətin qalxması ilə birgə bunu tərk edərsə həmin şəxs həm zahirən həm də, daxilən kafir olar.

Üz çevirənlə isə, zahirdə kafir müamiləsi aparılır.Onun daxilinə gəldikdə isə, onun daxili küfrünə yalnız onun üzərindən hüccət qalxandan sonra hökm verəcəyik.Çünki alimlərdə sabit qaydaya əsasən, zina edən şəxs zinakardır.Bəzən insan buna görə cəzalanır bəzən isə cəzalanmır.İnsan zinanın haram olduğunu biləcəyi za-man zina etsə cəzalanar.Lakin əgər yenicə İslamı qəbul edib onun haram olduğunu bilmədiyi halda zina edərsə zinakar adı onun üzərində qalacaq.Lakin bilgisizliyi səbəbilə cəzalanmayacaq.Bu mövzuya dair müxtəlif sözləri cəm edən amil budur.

Beləliklə də, bu mövzuda zahiri küfr ilə daxili küfr arasında fərq qoyulur.Qaydanın əsası odur ki, insan yalnız hüccət qalxandan sonra təkfir olunur.Uca Allah buyurur: **“Biz elçi göndərməmiş əzab verməri̇k.”** Burada gələn əzab, yalnız insanın üzərindən dünyada yaxud axirətdə qaldırılan hüccətdən sonra olur.Lakin bəzən dini qorumaq məqsədilə onunla kafir müamiləsi edilir. Həmin şəxs üçün bağışlanma dilənmir, onun adından qurban kəsilmir, onunla evlilik qurulmur və digər əhkamlar.

Belə ki, dəvət imamlarının bu məsələyə dair sözlərində zahiri küfr ilə daxili küfr arasında fərq qoyulur.Onlar mövcud durum yönündən həmin məsələni ayırırlar.Lakin qayda olaraq qeyd etdikləri zaman deyirlər: Onun küfrü, üz çevirmə və cahillik yaxud təkəbbürlük və imtina olsun eynidir.Lakin müəyyən şəxsə tətbiq edildiyi zaman bunu, üzərindən açıq-aydın hüccət qaldırılan şəxsə şamil edib ona küfrü isbat edirlər.Lakin üzərindən hüccət qalxmayan şəxsə gəldikdə isə, bəzən ona küfr adını şamil etmirlər. Buna misal, şeyx Muhamməd bin Abdul Vahhabın dediyi sözlərdir: Biz Küvvaz günbəzinə və Bədəvinin günbəzinə ibadət edənləri, onların diqqətinə çatdıran şəxsin yoxluğu səbəbilə təkfir etmirik. Şeyx, Cibillə əhlini və müxtəlif məbudlara ibadət edən digər insanları, onlara kifayət edici hüccətin çatmaması səbəbilə ilk çağlarda təkfir etməmişdir. Lakin bəzi insanlar bunlara küfr sözünü şamil edir və bununla şəriətin şəninin qorunması üçün onlarla küfr əhlinin müamiləsini qəsd edilrlər ki, insan müşrikə bağışlanma istəməsin, müşrikin adından qurban kəsməsin, müşriki dost tutmasın və digər əhkamlar.” (şərhu kəşfi-ş-şubuhat)

Qeyd: Elm əhlindən bəzisi, cahilliyi səbəbilə şirk edən şəxsin müşrik adlanacağını isbat etsələr belə ona kafir adını şamil etmirlər.Onlardan biri şeyx Muhamməd ibn Abdul Vahhabdır.Belə

ki, şeyx kitablarında şirk əhlindən olub üzərindən hüccət qalxmayan cahilləri müşrik adlandırır.Lakin üzərindən hüccət qalxan müşrikləri müşrik və kafir adlandırır.Buna şeyxin söylədiyi növbəti sözlərini misal göstərmək olar: “Övliyalara və saleh insanlara ibadət edənlərdən olan həmin müşriklərə və beləələri mislində olanlara müşrik hökmü veririk.Onların üzərindən hüccət qalxacağı zaman isə onların kafir olacaqlarını hesab edirik.”

<u>Şeyx Abdullah ibn Humeyd</u> (rahiməhullah)

Şeyxə “əsbəbu məcdil musliminəl əvail” adlı səsli yazıda sual verilmişdir: “Sovet ölkələrində, atalarının halı üzərə ateist olaraq ölən və gələn risalətlər barədə heç bir şey bilməyən insanlar vardır, yəni onlara Allahın dinini çatdıran şəxs olmamış və onlar İslam və digəri haqqında bilgiyə malik olmamışlar.Beləələri günah daşıyırlarmı? Habelə onların mükəlləf olduqlarını demək doğrudurmu?

Şeyx (rahiməhullah) cavab olaraq demişdir: “İslamı bilməyən insana gəldikdə, ilk öncə bilməliyik ki, alimlər bu məsələ barədə danışmışlar.Onlardan bəzisi demişdir: Quran hər bir şəxsə çatmışdır.Uca Allah buyurur: **“Onunla sizi və onun çatacağı hər kəsi xəbərdar edim.”** Quranın çatdığı hər bir şəxsin üzərindən hüççət qalxmışdır.Lakin fərziyyə şəklində və verilən suala güzəşt olaraq deyiləcək: Sən deyirsən: İnsanlar ateist olaraq yaşamış və İslamı, Quranı və ümumiyyətlə heç bir şeyi bilməmişlər.Onlar cəhənnəmə girəcəklərmi? Biz sənə: Xeyir!-deyirik.Onlara elçi göndəriləcək.Çünki sənin Rəbbin buyurur: **“Biz elçi göndərməmiş əzab verməarik.”** Artıq tədqiqatçı alim ibn əl-Qayyim bu məsələni mükəlləflərin təbəqələrini qeyd etdiyi zaman “tariqul hicrateyn” kitabının axırlarında qeyd etmişdir.O, demişdir: Həddi-

buluğa çatmamış müşriklərin övladları və müsəlmanların övladları haqqında deyilmişdir ki, qiyamət günü onlara elçi göndəriləcək və onlara ağıl və bigli veriləcək.Həmin elçiyə itaət edən cənnətə, ona asi olan isə cəhənnəmə girəcək.Onlar bu ayəni dəlil gətirmişlər: **“Biz elçi göndərməmiş əzab verməik.”** Həmin məsələ ibn əl-Qayyimin kitabında geniş şəkildə qeyd olunmuşdur.

Şeyx Abdullah bin Humeydə (rahiməhullah) sual verilmişdir: Qəbirləri təvaf edən və ondan mədəd diləyən şəxs haqqında, filankəs kafirdir demək olarmı yoxsa onun əməlinin küfr olduğunu deyəcəyik?

Şeyx cavab olaraq demişdir: “Biz deyirik: Sənin əməlin küfrdür. Həmçinin sənin küfrünü tələb edir.Həmin müəyyən şəxs küfr edir. Biz deyirik: Bu əməl küfrdür, həmin şəxs isə əməli ilə kafir olur. Madam ki, insan ibadəti Allahdan qeyrisinə yönəldir biz ona: Sən əməlinlə kafir olmusan,-deyirik.Əgər həmin şəxs bu hal üzərə ölərsə, onun meyyiti yuyulmaz, ona cənazə namazı qılınmaz və müsəlman yaxınları ona varis çıxmazlar.Həmin şəxs ölməsə isə, onun zövcəsi ondan dərhal boşanmış sayılacaq.Həmin şəxs şəhadət kəlməsini min dəfə desə belə, o, ona fayda verməz.Həmin şəxs dəstəmazsız namaz qılan insan mislindədir.Onun namazı dəstəmazsız səhih deyil.Məgər bu, namaz ona fayda verəcək? Belə şəxs “lə iləhə illəllah” sözünü dilə gətirir lakin Allahdan qeyrisindən yardım və mədəd diləməklə onu batil və puç etmişdir.Çünki “lə iləhə illəllah” kəlməsi, yerdə və göydə Allahdan başqa haqq məbudun olmadığını tələb edir.İbadətə layiq olan da, məhz Odur. Yalnız Allahın layiq olduğu ibadət, Allahın aşkar və gizli söz və əməllərdən sevib razı qaldığı hər bir şeyə verilən yığcam addır.” (şərhu kəşfi-ş-şubuhat, ikinci səsli yazı)

Şeyx Salih əs-Suheymi (hafizahullah)

Şeyx demişdir: "Lə iləhə illəllah şəhadətini dilə gətirən və onu pozan şəxs müsəlman olurmu? Yəni, məsələn bir şəxs "lə iləhə illəllah, Muhammədun rasulullah" şəhadətini dilə gətirir daha sonra qəbirdə olan ölülərə qurban kəsir, onlara nəzr edir və onlardan yardım istəyir.Həmin şəxs müsəlmandırmı? Xeyir, müsəlman deyil.İxtilaf yalnız, həmin şəxsin üzərindən hüccət qalxmayacağı zaman onun Allah qatında üzürlü olub olmaması ətrafındadır. İxtilaf nöqtəsi məhz budur.Bununla belə, həmin şəxs müşrik adlanır və onun əməli şirk adlanır.Lakin nəsihət edəcəyin zaman söhbəti başlayıb: Sən müşriksən!-demə! Xeyir, ey Allahın qulu, xeyir! Onu çəkindir, ilk öncə ona tövhidi anlat və onu pozan amilləri ona izah et! Daha sonra gözəl üslubla ona yol tapıb söylə: Ey Allahın qulu! Sənin bu əməlin yaramır.Mən səndən ötrü narahatam.Mən özüm üçün istədiyim kimi sənin üçün də xeyir istəyən müsəlman qardaşınam v.s.". (şərhu fədlil isləm, on ikinci səsli yazı)

Şeyx Sad əş-Şisri (hafizahullah)

Şeyx demişdir: "Deyir ki, şirkə düşən avam insanlar buna, yaramaz alimlərin və zəlalət dəvətçilərinin üzündən düşürlər.Bilmir onlar günah daşıyırlar yoxsa onlar kafirdilər? Deyirik ki, burada iki məsələ var.Onlar günah qazanırlarmı? Deyirik ki, əgər onlar haqqı bilmirlərsə günah qazanmırlar.Belə insan kafirdirmi? Deyirik ki, bəli kafirdir.Bizdə burada iki məsələ vardır.Günah və axirət cəzası.Həmin adamlar günah qazanmır və axirətdə cəzaya məruz qalmırlar. Çünki Uca Allah buyurur: **"Biz elçi göndərməmiş əzab verməri̇k."** Bu şəxsə dəvət çatmamışdır.Uca Allah buyurur: **"Onunla (Quranla) sizi və onun çatacağı hər kəsi xəbərdar edim".**Habelə buyurur: **"Biz müjdə verən və qorxudan elçilər göndərdik ki, insanların**

**elçilərdən sonra Allaha qarşı bir bəhanəsi olmasın.**"Beləsinə risalət çatmamışdır.Bu şəxs hökm olaraq kafirdirmi? Deyirik: Madam həmin şəxs şirk üzərədir o, kafirdir." (şərhu kəşfi-ş-şubuhat)

Şeyx Abdul-Əziz ər-Racihi (hafizahullah)

Sual: Avam sufilər, qəbirlərə ibadət edənlər və avam rafizilər cahillik səbəbilə üzürlüdürlərmi?

Cavab: Düşünürəm ki hazırki əsrdə avam insanlara dəvət çatmışdır.Hər kimə dəvət çatar və hüccət çatarsa, Quran və Sünnə çatarsa, üzürlü olmaz.İnsan yalnız, Quran və Sünnədən olan hüccət ona çatmayacağı zaman üzürlü olacaq.Uca Allah buyurur: **"Biz elçi göndərməmiş əzab verməriк."** Artıq Uca Allah peyğəmbər göndərmişdir.Uca Allah buyurur: **"Onunla (Quranla) sizi və onun çatacağı hər kəsi xəbərdar edim".**Kimə Quran çatarsa onun üzərindən hüccət qalxar.Habelə Peyğəmbər (salləllahu aleyhi və səlləm) səhih hədisdə demişdir: "Nəfsim əlində Olana and olsun ki, bu ümmətdən olan hər hansı bir yəhudi və nəsrani mənim haqqımda eşidib ardından mənə iman etməsə oda girər." Əgər birinin üzərindən hüccət qalxarsa və dəlil çatarsa o, üzürlü olmayacaq.Hüccəti anlamaq isə şərt deyil.Bunun hər hansı bir şeyə dəlil olduğunu bilmək üçün hüccətin çatması kifayətdir.Lakin bəzi elm əhli demişlər: Haqqın gizlədilməsi və zəlalət və şirk əhlinin üstün olması və insanlara batili haqq kimi göstərmələri səbəbilə əgər bəzi insanlara məsələ qaranlıq, haqq isə müəmmalı qalarsa və insan haqqı bilməzsə, ona "fətra əhli"nin hökmü verilər.Onun işi isə Allaha buraxılar.Lakin insan həmin hal üzərə öləcəyi zaman onun üçün qüsl alınmaz, ona cənazə namazı qılınmaz, müsəlmanların qəbiristanlığında dəfn edilməz və onun üçün dua edilməz.Hər bir halda insana dəvət, Quran və Sünnə

çatacağı zaman və bunun haram olduğunu biləcəyi zaman üzürlü olmayacaq.Hal-hazırda İslam dəvəti dünyanın şərqini və qərbini əhatə etmişdir.Lakin bəzi müşriklərin haqqı eşitməyə və onu qəbul etməyə qulaqları kar olduğu və onu rədd etdiyi üçün onlara üzr yoxdur.İnsanın haqqa can atması, onu tələb etməsi, habelə haqq və din haqqında soruşması gərəkdir.İnsan dünya işlərində, qazanc, maaş, alış-verişdə səylə çalışdığı kimi həmçinin dinini öyrənmək üçün çalışmalı və ona qaranlıq qalan məsələlər barədə soruşmalı, habelə haqqı axtarmalıdır.İnsan haqqı bilməyəcəyi zaman isə üzürlü olacaq.Lakin haqqı bilmək imkanında olacağı və sual verməyə qadir olduğu halda soruşmayacağı zaman üzürlü olmayacaq." (Şərhu kitəbil imən, Əbu Ubeyd əl-Qasim Sələm, suallar)

Səudiyyə ərəbistanı muftisi Abdul-Əziz Alu-ş-Şeyx (hafizahullah)

Sual: Allahdan qeyrisinə dua edənin, məsələn: Ey filankəs ağam mənin dadıma çat!-deyən şəxsin kəsdiyi ət yeyilirmi, baxmayaraq ki, həmin şəxs Allahı və Peyğəmbərini sevir və çoxlu ibadət və sədəqələr edir? Habelə cahil olduqarı yaxud etdiklərinin onları Allaha yaxınlaşdırdığını zənn etdikləri halda Allahdan qeyrisinə dua edən bu şəxslərin arxasında namaz qılmaq və onlar üçün bağışlanma diləmək olarmı, ələxsus onların əksəriyyəti cahildirlər və onların İslam haqqında heç bir bilgisi yoxdur? Bu məsələyə izah gətirməyinizi rica edirik.Allah sizi xeyirlə mükafatlandırsın.

Cavab: Bismilləh! Aləmlərin Rəbbinə həmd olsun! Allahın salavatı, salamı və bərəkəti Allahın qulu və elçisi Muhammədin, onun ailəsinin və səhabələrinin üzərinə olsun.

Taifdə yaşayan qardaş sualında deyir: Əgər bir insan: Ey Allahın Elçisi! Mənə yardım et yaxud mənim kədərimi apar yaxud

borcumu ödə!-deyirsə, onun kəsdiyi əti yeyəcəyikmi? Biz deyəcəyik: Ey qardaşım! Bizə onu yemək halal deyil.Çünki Uca Allah buyurur: **“Əgər Allahın ayələrinə inanırsınızsa, üstündə Onun adı çəkilmiş-“bismilləh” deyilib kəsilmiş heyvanlardan yeyin.”** Habelə buyurur: **“Üstündə Allahın adı çəkilmiş-“bismilləh” deyilib kəsilməmiş heyvanlardan yeməyin.Çünki bu, günahdır.”** Əgər “bismilləh” sözünü deyən müşrik olarsa bu sözün heç bir təsiri olmaz.Çünki peyğəmbərlərə və saleh insanlara dua edib onlardan yardım diləyən və: Ey ağam mənim dadıma çat yaxud mənim kədərimi apar!-deyən şəxs haqqında deyəcəyik: Bu adam Allaha şərik qoşmuşdur.Çünki o, Allahdan qeyrisinə dua etmişdir.Allahdan qeyrisinə dua etmiş və Allahdan qeyrisinə pənah aparmışdır.Bu, təvəssül deyil.Lakin bu xalis duadır.Əslində bu, insanı İslamdan çıxaran şirk təvəssüldür. Hətta əgər “bismilləh” deyərsə belə bizə bütpərəstin kəsdiyi əti yemək halal deyil. Çünki o, müşrikdir və onun bütün əməlləri puçdur.Bu üzdən, Allahdan qeyrisinə ibadət edən yaxud qəbirlərdə olanları təzim edən, onlardan yardım diləyən, onların qəbrini təvaf edən və onlara müxtəlif qurbanlar gətirən şəxs heyvan kəsərsə, bu adam müşrikdir və onun kəsdiyi ət Allahdan başqasının adı ilə kəsilmiş növə daxildir.Uca Allah buyurur: **“Leş, qan, donuz əti və Allahdan başqasının adı ilə kəsilmiş sizə haram edildi.”** Qəbirlər üçün qurban kəsən bu şəxs “bismilləh” desə belə Allahdan başqasının adı ilə kəsmiş sayılır və onun kəsdiyi əti yemək haramdır.Habelə Allaha şərik qoşan şəxsin arxasında namaz qılmaq olmaz.Biz Allahdan qeyrisinə ibadət edənin, peyğəmbərlərə, övliyalara və saleh insanlara dua edənin arxasında namaz qılmırıq.Biz onların arxasında namaz qılmırıq. Çünki onların ibadəti batildir.Uca Allah buyurur: **“Sənə və səndən əvvəlkilərə belə vəhy olunmuşdur: Əgər şərik qoşsan, əməlin**

**puç olacaq və mütləq ziyana uğrayanlardan olacaqsan.Sən yalnız Allaha ibadət et və şükür edənlərdən ol!”**.Allahdan qeyrisinə dua edib Allahdan qeyrisinə ibadət edən, onu təzim edən şəxsin bütün əməlləri puça çıxmışdır.Onun namazı batildir və məqbul deyil.Lakin sən deyirsən ki, onların arasında cahillər vardır.Habelə onların arasında Allahı, Peyğəmbəri və dinini sevənlər vardır.Biz deyirik: Bəli! Onların arasında cahillər və Allahı və Peyğəmbəri sevdiyini göstərən şəxslər vardır.Lakin Allaha və Peyğəmbərə qarşı olan bu sevgi sadiq sevgi deyil. Əgər bu sevgi sadiq olsaydı, həmin adamlar Bir olan Allaha ibadət edərdilər.Onun bu sevgisi ona heç bir fayda verməyəcək. İnsan Allaha ibadət edib Onu ibadətdə təkləşdirməyincə sevgi iddiasında olması ona heç bir fayda verməyəcək.Çünki Uca Allah buyurur: **“Əgər Ona şərik qoşsaydılar, əlbəttə, etdikləri əməllər puç olardı.”** Şirk bütün əməlləri puça çıxarır. Habelə Uca Allah müşrikdən heç bir əməlini qəbul etmir.Uca Allah buyurur: **“Həqiqətən də, Allaha şərik qoşan kimsəyə, Allah cənnəti haram etmiş və onun sığınacağı yer cəhənnəmdir.Zalımlara kömək edən olmayacaq.”** Beləsi öləndə, biz onun üçün bağışlanma diləmir və ona cənazə namazı qılmırıq.Çünki Uca Allah buyurur: **“Heç vaxt onlardan ölmüş bir kəsin cənazə namazını qılma, qəbirinin başında da durma.”** Habelə buyurur: **“Müşriklərin cəhənnəm sakinləri olduqları onlara bəlli olduqdan sonra, qohum olsalar belə, Peyğəmbərə və mömінlərə onlar üçün bağışlanma diləmək yaraşmaz.”** Habelə buyurur: **“İbrahimin öz atası üçün bağışlanma diləməsi isə sadəcə ona verdiyi vədə görə idi.Atasının Allaha düşmən olduğu na bəlli olduqdan sonra isə ondan uzaqlaşdı.”**

Ey qardaşım! Biz bu adamlara bu dünyada kafirlərin əhkamlarını icra edirik.Yəni, onların arxasında namaz qılmırıq, onların kəsdiklərini yemirik və onlara zahiri əhkamları icra edirik.Lakin onlardan biri öləcəyi zaman biz onlara küfrün zahiri əhkamlarını icra edirik.Axirətə gəldikdə isə, bu iş Allaha aiddir.Ola bilsin ki, həmin şəxsin sonluğu yaxşı olsun və sonucda gözəl sonluğa müvəffəq olsun.Bunu Allah daha yaxşı bilir.Lakin bu dünyada müşriklərin əməlini edən, ölülərə dua edən yaxud övliyalara dua edən, onlardan yardım istəyən, onlara pənah aparan, onlara qurban kəsən, onlara nəzr edən və onlara dua edən şəxslərə zahirdə küfr hökmünü veririk.Ölümdən sonra onun işi isə Allaha aiddir.Onun gözəl sonluqla ölməsi isə mümkündür.Bu, Allaha aiddir.” (fətəva nurun alə-d-dərb)

Şeyx Muqbil (rahiməhullah)

Sual: Küfr yaxud bidət edən şəxsə hüccəti qaldırmaq şərtdirmi. Çünki biz bilirik ki, Peyğəmbər (salləllahu aleyhi və səlləm) Zul Xuveysira adlı şəxsə hökm verib demişdir: “Bunun belindən dindən çıxmış tayfa çıxacaqdır.” Habelə Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: “Xəvariclər cəhənnəmin köpəkləridir.” Habelə demişdir: “Qədərilər bu ümmətin məcusiləridir.”

Cavab: Onun zahiri əməlinə uyğun hökm veriləcək.Cahilliyin üzr olması məsələsi isə onunla Allah arasında olan məsələdir.Biz iman edir və etiqad edirik ki, cahillər üzürlüdürlər.Ola bilsik ki, qiyamət günü Arasat meydanında imtahana çəkilsinlər.Əbu Hureyranın və Əsvad bin Səriin hədisində gəldiyi kimi.” (tuhfətul mucib:104-cü sual)

Şeyx Abdul-Muhsin əl-Abbad (hafizahullah)

Şeyx "əl-idah va-t-təbyin" kitabında qəbirlərə tapınan müşriklərin halını bəyan etdikdən sonra demişdir: "Bu, üzərindən hüccət qalxmış şəxsin hökmüdür.Ancaq üzərindən hüccət qalxmayan və İslamı tanımayan ölkələrdə yaşayan, bununla belə salehlərə qarşı ifrata varmaq, onlardan imdad və yardım diləmək və onlara dua etmək kimi bu batil işləri insanlara bəzəyən və etdikləri şirkə və Allahdan başqa ibadət etdiklərinə susan saxta alimlərə aldanan insana gəldikdə isə, həmin şəxsin zahiri küfrdür və o, bu dünyada üzərindən hüccət qalxmış şəxs kimi eyni münasibət (müamilə) görür və belə şəxsin arxasında namaz qılınmır, ölərsə ona cənazə namazı qılınmır, onun üçün dua edilmir və onun əvəzinə həcc yerinə yetirilmir.Bununla belə axirətdə onun işi Allaha aiddir.Çünki həmin şəxs, səmavi risalətlərin dəvətindən kənar qalan "əhlul fətərat" mislindədir. Onlar qiyamət günü imtahan ediləcəklər və imtahandan sonra cənnətə yaxud cəhənnəmə gedəcəklər."

Bir qədər sonra demişdir: "Ötənlərdən aydın olur ki, üzərindən hüccət qalxan və son mənzili əbədi atəş olan şəxsin küfrü ilə "fətərat əhli" və onların hökmündə olub salehlərdən kömək istəmək və digər aşırı əməllər üzərində böyüyüb başa çatmış və camaatı zəlalətə sürükləyən saxta alimlərə uyaraq İslamın yalnız bu əməldən ibarət olduğunu düşünən insanlar kimi üzərindən hüccət qalxmayan şəxsin küfrü arasında fərq mövcuddur.Bu şəxslərin işi Allaha aiddir və onlar qiyamət günü imtahan ediləcək və bundan sonra onlardan bəzisinin son mənzili cənnət bəzisinin isə cəhənnəm olacaqdır."

Habelə həmin risalədə davam edərək demişdir: "Bu risalədə, üzərindən hüccət qalxmış şəxslə üzərindən hüccət qalxmamış şəxs arasında gələn təfsilat etimad göstərilən sözdür.Eşitmə yaxud

oxunma vasitəsilə məndən gələn və bunun tam əksi olaraq anlaşılan hər hansı bir sözə etimad göstərilməməlidir.Etimad yalnız bu risalədə gələn təfsilata göstərilməlidir.

Qeyd etdiyim bu təfsilat şeyximiz şeyx Abdul-Əziz ibn Bəzın (rahiməhullah) "məcmu` əl-fətava:1/49" kitabında dediyi sözə yaxındır: "Lakin qəbirlərə ibadət edənlərin çoxu qəbir sahiblərinə qurban kəsməklə və nəzr etməklə yaxınlaşdıqları kimi qəbir sahiblərinə onların qəbirlərini təvaf etməklə onlara yaxınlaşırlar. Bütün bunlar böyük şirkdir.Əgər biri bu hal üzərə ölərsə kafir olaraq ölər və ona qüsl alınmaz, ona cənazə namazı qılınmaz, həmin şəxs müsəlmanların qəbiristanlığında dəfn edilməz və əgər həmin adama dəvət çatmayıbsa axirətdə onun işi  Allaha aiddir və ona"əhlul fətra" hökmü şamil olunur."

Habelə demişdir (9/40): "Əgər biri şirk üzərində ölərsə böyük təhlükə altında olar.Bunun ardınca ayələr qeyd edib dedi: "Bu, digər böyük küfrə düşən kafirlər tək onların təhdid edilməsi və aqibətidir.Onların dünyada olan hökmü, öldükləri zaman yuyulmaması, onlara cənazə namazının qılınmaması və onların müsəlmanların qəbiristanlığında dəfn edilməməsidir.Lakin əgər onlardan birinə dəvət, yəni Quran və Sünnə, çatmayıbsa, belə bir kimsənin işi digər "əhlul fətra" kimi qiyamət günü Allaha aiddir. Elm əhlinə görə bu məsələdə həmin şəxslərin hökmünə dair üstün görüş onların qiyamət günü imtahana çəkilməsidir.Onlardan dəvəti qəbul edənlər cənnətə, asi olanlar isə atəşə girər".Nəhayət dedi: "Lakin əgər onlardan biri düşdüyü şirkə dair cahil olarsa onun işi Uca Allaha aid olar və onun hökmü onun zahirinə uyğun verilər.Əgər birinin zahiri şirk olarsa onun hökmü müşriklərin hökmünə müvafiq olar, lakin işi hər şeyi bilən Uca Allaha aid olar.

Artıq şeyx Abdul-Əziz ibn Bazın bir çox fətvalarında Allahdan savayı ölü və qaiblərdən yardım diləyənlərin küfrünə dair sözlər yer almışdır.Şeyxdən gətirdiyim sözlərdə üzərindən hüccət qalxan ilə üzərindən hüccət qalxmayan arasında fərq qoyulmaqdadır.Şeyxin, üzərindən hüccət qalxmış şəxsi təkfir etməsi haqqında varid olan sözləri sahibini əbədi olaraq cəhənnəmə sürükləyən açıq-aydın küfrə aid edilir.Bu isə üzərindən hüccət qalxmayan və zahiri halının küfr olduğu və dünyada kafirlərə göstərilən münasibəti görən şəxsin əksidir.Belə şəxslərin axirətdə imtahan edildikdən sonra son mənzili ya cənnət yaxud da ki, cəhənnəm olacaq. Bununla da, şeyxdən mütləq şəkildə təkfirə dair gələn yığcam və ətraflı sözlər cəm edilmişdir.” (əl-idah va-t-təbyin fi hukmil istiğasəti bil əmvat val ğaibin:27-33)

Şeyx Salih əl-Luheydan (hafizahullah)

Sual: Bizdə olan bəzi insanlar deyirlər: Əgər biri böyük şirk edərsə, məsələn, Allahdan qeyrisinə dua edərsə yaxud Allahdan qeyrisinə qurban kəsərsə və nəzir edərsə, bunu cahilliyi üzündən etdiyi sürəcə müsəlman hesab olunacaq.Onların bu sözü doğrudurmu?

Cavab: Xeyir, bu doğru deyil.Məgər Uca Allah böyük şirk üzərə ölmüş şəxsləri, onlar cahil olduqları və onları dəvət edən peyğəmbər gəlmədiyi üçün bağışlamışdır?! Beləsinin üzürlü olduğu deyiləcəkmi?! Xeyir! Heç bir şəxsin böyük şirkdə üzürü yoxdur.İnsan tövbə etməlidir.Həmd olsun Allaha ki, tövbə qəbul edilir.Əgər biri uzun müddət Allaha şərik qoşarsa daha sonra sidqi ürəklə tövbə edərsə Uca Allah onun bütün şirkini bağışlayar.” (şərhu sahih muslim)

Şeyx Salih bin Useymin (rahiməhullah)

Qeyd etmək lazımdır ki, şeyx ibn Useyminin bu məsələyə dair məzhəbi dolğun şəkildə tədqiq edilməmişdir.Belə ki, bəzi insanlar onun iki görüşə sahib olduğunu, bəziləri onun öz rəyini dəyişdiyini bəziləri isə məsələdə təfsilat qoyduğunu qeyd edirlər.Lakin hər halda şeyx ibn Useyminin şirk edən şəxslərə, zahirə əsasən müşrik hökmünü verdiyinə dair sözlər varid olmuşdur və həmin sözlər burada qeyd ediləcək:

Sual: Bizim qəsəbəmizdə məscid imamı vardır.Həmin şəxs insanları Allahdan qeyrisindən yardım diləməyə çağırır və bunun insanları Allaha yaxınlaşdıran işlərdən olduğunu etiqad edir.Bu insana İslam hökmü vermək nə dərəcədə doğrudur? Habelə onun arxasında namaz qılmağın hökmü nədir?

Cavab: Deyirəm ki, Allahdan qeyrisinə dua edən və yardım istəyən həmin şəxs müşrikdir və şərə dəvət edəndir.Onun müsəlmanlara imam durması səhih deyil.Onun arxasında namaz qılınmaz. Habelə həmin şəxsin, ölüm onu haqlamamış tövbə etməsi gərəkdir.Yardım yalnız Allahdan istənilir.Bəzən yardım diri və yardım etməyə qadir olan şəxsdən istənilir.Uca Allah buyurur: **“Tərəfdarlarından olan kəs onu düşməninə qarşı yardıma çağırdı.”** (əl-Qasas:15) Ölülərdən yardım diləmək isə İslamdan çıxaran böyük şirkdir.Mən bu minbərdən həmin adamı tövbəyə çağırıram.Həmin adam bilsin ki, ölülərdən yardım istəmək, Allaha yaxınlaşdırmır.Əslində bu, onu Allahdan uzaqlaşdırır.Allahdan qeyrisindən yardım istəyən növbəti ayəyə daxildir: **“Həqiqətən də, Allaha şərik qoşan kimsəyə, Allah cənnəti haram etmiş və onun sığınacağı yer cəhənnəmdir.Zalımlara kömək edən olmayacaq.”** (əl-Maidə:72)” (sautiyyətu məuqi` əl-əsər)

Sual: Allahdan qeyrisini çağıran, Allahdan qeyrisinə and içən, qəbirləri təvaf edən və saleh insanların fayda və zərər verdiklərini etiqad edən müsəlmana zəkat vermək olarmı?

Cavab: Sualda qeyd olunan insan, müşrik və kafirdir.Allah ondan namazı, orucu, sədəqəni və qeyrisini qəbul etməz.Allahdan qeyrisinə dua edən müşrikdir.Qəbirlərə ibadət edən müşrikdir.Zəkatdan ona verilməz.Həmin şəxsi İslama dəvət etmək və ona tövhidi izah etmək gərəkdir.Həmin şəxs tövhidi qəbul edərsə, məqsəd hasil olacaq.Əks halda əmr sahibi şəriətin tələb etdiyi tədbirləri icra edəcək.Allahdan qeyrisinə and içən şəxsə isə zəkat malından verilir.Çünki Allahdan qeyrisinə and içmək, şirk olsa da, İslam dinindən çıxartmır.Beləsinə zəkat malından verilir və ona nəsihət edilir və bəyan edilir ki, Allahdan qeyrisinə and içmək şirkdir.Ola bilsin ki, Uca Allah ona hidayət versin." (sautiyyətu məuqi` əl-əsər)

Sual: Oruc tutan, namaz qılan, zəkat verən lakin bəzi İslam dövlətlərində yaxşı etiqad adlandırdıqları və övliyaların zərər və fayda verdiyini etiqad edən müsəlmanın aqibəti nədir? Habelə həmin şəxs övliyaya dua edib: Ey filankəs, mənim övladıma şəfa versən sənə filan şeylər verəcəyəm,-deyir və bu kimi ifadələr işlədir.Həmin şəxsin hökmü və müsəlmanın bu işdə aqibəti nədir?

Cavab: Qəbirlərə və övliyalara nəzr edib onlara dua edən həmin şəxsi müsəlman adlandırmaq, həmin adı ona verənin cahilliyindən irəli gəlir.Əslində həmin şəxs müsəlman deyil.Çünki o, müşrikdir. Uca Allah buyurur: **"Rəbbiniz dedi: Mənə dua edin, Mən də sizə cavab verim.Həqiqətən, Mənə ibadət etməyə təkəbbür göstərənlər cəhənnəmə zəlil olaraq girəcəklər."** Duanı yalnız Allaha etmək olar.Zərəri dəf edən məhz Odur.Mənfəəti cəlb edən də, Odur. **"Darda qalan kimsə yalvardığı zaman ona cavab verən,**

**şəri sovuşduran və sizi yer üzünün varisləri edən kimdir? Heç Allahla yanaşı başqa bir məbudmu var? Siz necə də az düşünürsünüz?”.** Beləsi namaz qılsa, zəkat versə belə Allahdan qeyrisinə dua edəcəyi, ibadət edəcəyi və nəzr edəcəyi sürəcə müşrik olacaq. **“Allah cənnəti haram etmiş və onun sığınacağı yer cəhənnəmdir.Zalımlara kömək edən olmayacaq.”** (fətəva nurun alə-d-dərb, ət-təuhid val aqidə)

Sual: Bu sözləri deyən haqqında nə deyərdiniz: Əhli Sünnənin əqidəsi bu qayda üzərədir: Müsəlman günahı halal saymayınca təkfir olunmaz.Habelə həmin qayda mütləqdir və məsələn qəbirə səcdə etmək yaxud qəbiri təvaf etmək yaxud İslam dini ilə istehza etmək və digər günahlar olarsa belə insanı kafirə çevirən və İslamdan çıxaran günah yoxdur?

Cavab: Biz küfrün bir çox səbəblərdən olduğunu hesab edirik. Onlardan: İnsanın, səcdə etməsə belə Allahdan qeyrisinə səcdə etməyi etiqad etməklə kafir olmasıdır.Habelə zarafatca olsa belə İslamı məsxərəyə qoyan kafir olur.Buna Qurani Kərim dəlalət edir: **“Onlardan nə üçün istehza etdiklərini soruşsan, deyərlər: Biz sadəcə boş-boş danışıb zarafatlaşırdıq! De: Allaha, Onun ayələrinə və Onun Elçisinə istehzamı edirsiniz? Üzrxahlıq etməyin! İman gətirdikdən sonra artıq kafir oldunuz.”** (ət-Təubə:65-66)

Biz hesab edirik ki, əgər biri küfr olacaq əməllər edərsə, buna görə həmin insan kafir hesab olunar və dünyada onunla kafir müamiləsi aparılar.Axirətdə isə, sorğu-sualı Allaha aiddir.Əgər biz bütə səcdə edən şəxsi görsək onun kafir olduğuna hökm verəcəyik.Deyəcəyik: O, kafirdir.Tövbəyə çağırılmalıdır.Tövbə etməzsə öldürüləcək.Hətta həmin şəxs desə ki, mən zəlillik və boyun əymə

səcdəsini qəsd etmədim.Lakin mən, məsələn salam səcdəsini qəsd etdim.Biz deyəcəyik: Bu, bizi maraqlandırmır.Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: “Əgər mən hər hansı bir şəxsə səcdə etməyi əmr etsəydim qadının öz ərinə səcdə etməsini əmr edərdim.”

Habelə əməllərdən bəzisinin tərk edilməsi küfrdür.Məsələn namaz.Namazı tərk edən şəxsə müəyyən olaraq kafir hökmü verəcəyik.Biz deməyəcəyik: Namazı ümumən tərk edən kafirdir.Biz belə deyəcəyik.Lakin bir şəxsin namaz qılmadığını görəcəyimiz zaman onun küfrünə və qanının hədər ediləcəyinə hökm verəcəyik.Təbii ki, tövbə edib Allaha qayıdacağı zaman müstəsnadır.

Önəmli olan, qeyd etdiyim həmin qaydanın mütləq olmamasıdır. Çünki əgər biz küfrün yalnız halallaşdırma ilə olacağını desək əməli küfr qalmayacaq.Çünki halallaşdırma özlüyündə küfrdür.İnsan icmayla haram olan şeyi halal sayacağı zaman bunu etsə yaxud etməsə belə kafir olacaq.Əgər bir nəfər məsələn zinanı yaxud sələmi halal sayarsa biz həmin şəxsin kafir olduğunu deyəcəyik.” (liqaul  bəbil məftuh:163)

Şeyx ibn Useymin (rahiməhullah) demişdir: “Bu ayənin faydalarından imanın qəlbdə olmasıdır.Uca Allah buyurur: **“Qəlbləri iman gətirmədiyi halda”**.Lakin biri deyə bilər: Məgər biz insanların zahirini götürməyə əmr olunmamışıqmı? Cavab: Bəli! Biz bununla əmr olunmuşuq.Lakin əgər birinin münafiqliyi bəlli olarsa biz onun halının tələb etdiyi amillərə əsasən onunla müamilə edəcəyik.Habelə əgər biri münafiqliyi elan edərsə biz buna susmayacağıq.Münafiqliyi bilinməyən şəxsə gəldikdə isə, bizə qalan yalnız insanın zahiridir.Daxil isə Allaha aiddir.Habelə əgər biz kafir bir insanı görsək onunla kafir müamiləsi aparacağıq və

hal-hazırda bəzi tələbələrə qaranlıq qaldığı kimi onu müəyyən olaraq təkfir etmirik deməyəcəyik.Onlar deyirlər: İnsanın namaz qılmadığını gördüyün zaman onu müəyyən olaraq təkfir etmə! Necə yəni müəyyən olaraq təkfir etmir?! İnsanın bütə səcdə etdiyini görəcəyin zaman onu müəyyən olaraq təkfir etmirsən. Çünki onun qəlbində imanın sabit olduğu ola bilər!

Deyiləcək: Bu, çox böyük yanlışlıqdır.Biz zahirə hökm veririk.Biz bir adamın namaz qılmadığını görəcəyimiz zaman ağız dolusu onun kafir olduğunu deyəcəyik.Bir şəxsin bütə səcdə etdiyini görəcəyimiz zaman onun kafir olduğunu müəyyən olaraq deyəcəyik və onu İslamın əhkamlarına riayət etməyə vadar edəcəyik.Əgər etməzsə onu qətlə yetirəcəyik.Axirətə gəldikdə isə, Peyğəmbərin şahidlik etdiyi və Quranda gələn şəxslər müstəsna heç bir müəyyən şəxsin cənnətlik yaxud cəhənnəmlik olduğuna şahidlik etməyəcəyik." (təfsiru surati-l-məidə:14)

Gördüyünüz kimi şeyxin bəzi sözlərini öz maraqlarını təmin etmək üçün götürən bəzi qərəzli şəxslərdən fərqli olaraq şeyx ibn Useymin müamiləni isbat edir və bu üslubun doğru olduğunu vurğulayır.Lakin "müamilə" adlı məsələnin bidət, əsli olmayan iş, fəlsəfə v.s. olduğunu deyənlər hara şeyx ibn Useymin (rahiməhullah) hara?!

Şeyx Muhamməd Əli Fərkus (hafizahullah)

Sual: Bu ümmətin, günahların ən böyüyü olan şirk bəlasına tutulması sizə gizli deyil.Bizim şəhərimizdə demək olar ki, elə bir ev tapmaq mümkün deyil ki, onlar saleh şəxslərə tapınmasın, habelə onların bəzi rübubiyyət xüsusiyyətlərinə malik olduqlarını etiqad etməsin və onlara ibadətin müxtəlif növlərini yönəltməklə onlara

yaxınlaşmasınlar.Heç şübhəsiz ki, bu işlər cahillikdən və zəlalət dəvətçilərinin çoxluğundan irəli gəlir.

Bizim sualımızın məğzi: Bu insanlara müəyyən olaraq müşrik hökmü verilib onlarla müşriklərin müamiləsi aparılacaqmı? Həmin şəxslər öləcəyi zaman onlara rəhmət oxumaq, onlar üçün dua etmək olarmı? Bu məsələyə aydınlıq gətirməyinizi rica edirik.

Şeyx cavab olaraq demişdir: "Aləmlərin Rəbbi Allaha həmd olsun. Allahın salavatı və salamı aləmlər üçün rəhmət olaraq göndərilən Peyğəmbərə, onun ailəsinə, səhabələrinə və qiyamət gününəcən gələcək qardaşlarına olsun!

Sonra isə qeyd etmək lazımdır ki, böyük şirkə düşən şəxsin üzərindən şirk vəsfi aradan qalxmır və hüccət qalxmamışdan öncə cahillik ilə birgə, habelə hüccətdən sonra sabit olur.Çünki Allahdan qeyrisinə edilən ibadətlə birgə qətiyyən İslam olmur.İnsan müsəlman olduğunu bildirsə belə bu, yalnız müşrikdən hasil olur. Bunun mənası: Əgər biri Uca Allaha və başqa ilaha ibadət edərsə müsəlman olmayacaq.Ona ibadət etməyən, üstəlik Ona ibadət etməyə təkəbbürlük göstərən şəxs həmçinin müsəlman olmur. Müşrik birisi müsəlmanların sırasında deyil.Çünki Allahın razı qaldığı və Peyğəmbərini onunla göndərdiyi İslam dini, Bir olan Allaha təslim olmağı və yalnız Ona ibadət etmək məqsədilə Allaha boyun əyməyi ifadə edir.Lakin insanlar iki qism olur: Biri yalnız Allaha ibadət edən müsəlman, digəri isə Allahdan qeyrisinə ibadət edən müşrik olur.Adəm oğulları içində üçüncü qism yoxdur. Bu səbəbdən, əgər biri, üluhiyyət xüsusiyyətlərindən olub yalnız Allaha məxsus olan hər hansı bir şeyi Allahdan qeyrisinə təqdim edərsə, dini xalis Allaha aid edərək Allaha ibadət edən şəxslərdən olmaz.İnsan müsəlman olmayacağı zaman isə müşrik olacaq və

burada üçüncü qism yoxdur.Artıq ibn əl-Qayyim (rahiməhullah) növbəti ayə barədə söhbət əsnasında demişdir: **“Səfeh olanlardan başqa kim İbrahimin dinindən üz çevirər?”**.İmam demişdir: “Uca Allah yaratdığı məxluqatı iki qismə ayırmışdır: Səfehlikdə son həddə çatan səfeh şəxs və ağlı başında olan şəxs. Səfeh, İbrahimin dinindən üz çevirib şirki seçəndir.Ağlı başında olan isə söz, əməl və hal olaraq şirkdən uzaq duran şəxsdir.Bu səbəbdən, onun sözü, habelə əməli və halı tövhid olmuş, onun dəvəti tövhid olmuşdur.Tövhiddən üz çevirən isə istəsə də, istəməsə də, müşrikdir.Sünnədən üz çevirən şəxs isə istəsə də, istəməsə də, bidətçi və azmışın birisidir.” (mədəricu-s-səlikin:3/446)

Bu səbəbdən, bilmək lazımdır ki, şirk vəsfi insanın üzərindən hüccət qalxmamışdan öncə sabit olur.Lakin onun hökmü hüccət qalxandan sonra veriləcək hökmdən fərqlənir.Belə ki, şirk edən şəxs hüccətdən öncə müşrikdir lakin həmin şəxs dünya və axirətdə cəzaya layiq deyil.Dünyada qətlə yetirilməyə, axirətdə isə odda yanmağa layiq deyil.Bu işlər yalnız müşrikin üzərindən hüccət qalxacağı zaman sabit olur.Çünki təkfir və mürtədlik məsələlərinə daxil olan müşrikin cəzaya məruz qalması məsələsi, yalnız və yalnız şəriət məhkəməsinin xüsusiyyətləri növündən olan işdir. Yəni, müsəlman hakim həmin işi, Allahın əhdi pehman aldığı Əhli Sünnədən olub möhkəm elmi və ədaləti ilə tanınan elm əhlinə tapşırır.Şəriət instansiyalarının tapşırığı olmadan hər hansı bir şəxsin bu işi öz öhdəsinə götürməsi yolverilməzdir.

Bir sözlə, əgər birinə dəvət və hüccət çatmazsa və həmin şəxs böyük şirk üzərə olarsa adicə cahilliyi səbəbilə deyil hüccətin catmaması səbəbilə üzürlü olacaq.Çünki insan imanın əsaslarında sadəcə cahilliyi səbəbilə üzürlü olmur.Peyğəmbər (salləllahu aleyhi və səlləm) Əbu Hureyranın (radıyallahu anhu) rəvayət etdiyi

hədisdə demişdir: “Nəfsim əlində Olana and olsun ki, bu ümmətdən olan yəhudi yaxud nəsranilərdən hər hansı bir şəxs mənim haqqımda eşidib mənim gətirdiyimə iman etmədən ölərsə atəş əhlindən olar.” (Muslim, iman kitabı:153, Əhməd:8397) Bu səbəbdən, əgər birinə ümumiyyətlə dəvət çatmazsa və həmin şəxs heç bir xəbər eşitməzsə, həmin şəxsdən, dünyada və axirətdə cəzanın sabit olması ilə nəticələnən küfr inkar ediləcək.Buna rəğmən həmin şəxsə İslam hökmü verilməyəcək və müsəlman anlamına daxil olmayacaq.Çünki şirk onlara (vəsf olaraq) doğru səslənir və onun adı onları şamil edir.Lə iləhə illəllah şəhadəti olan ən əzəmətli təməlin pozulması ilə birgə İslam qalmır.Onların durumu, pisi və yaxşını ayırmaq qabiliyyətinə çatmadan ölən müşriklərin övladları mislindədir.Onlardan, dünyada və axirətdə olan cəza etibarı ilə şirk adı inkar edilir.Lakin dünya əhkamlarında onlara müşrik valideyinlərinin hökmü verilir.

Hüccət çatan şəxsə, ələxsus müsəlman ölkələrində yaşayan şəxslərə gəldikdə isə, beləsi adicə şirk etməklə, ona şirk vəsfi sabit olur və həmin şəxs əzab təhdidi altına girir.Onun cahillik səbəbilə imanın əsaslarında üzürü yoxdur.Artıq buna dəlil olaraq Əbu Hureyranın hədisini qeyd etmişik.Lakin şirk hökmü ilə əzabın inkar edilməsi arasında ayrılmaz bağlılıq yoxdur.Belə ki, dünya və axirətdə əzaba məruz qalan hər bir şəxs müşrikdir.Lakin heç də hüccət qalxmamış hər bir müşrik əzaba məruz qalmır.Şəhadəti dilə gətirən şəxs “lə iləhə illəllah” tövhidinin şərtlərini gerçəkləşdirdiyi zaman, buna şirk əlavə olunmazsa yaxud həmin şəhadəti pozan amillərdən birini etməklə onun etiqadında dəyişiklik baş verməzsə həmin şəxsə islam əhkamları icra olunacaq.Əks halda ona mürtədin əhkamları icra olunacaq.

Müsəlmanın şirkə və onun əhlinə nifrət etməsi, onları sevməməsi və Allahı qəzəbləndirən və narazı salan sözlər, əməllər və etiqadlara nifrət bəsləməklə Rəbbinə müvafiq gəlməsi, habelə daimi şəkildə bu işlərdən uzaq durması gərəkdir.Habelə (kafirlərə düşmənçilik) hüquqlarından şirk əhlini sevməmək və onları dost tutmamaqdır.Uca Allah buyurur: **“Ey iman gətirənlər! Mənim düşmənimi də, öz düşməninizi də, özünüzə dost tutmayın!”**.(əl-Mumtəhənə:1) Onlar üçün bağışlanma və rəhmət dilməmək.Uca Allah buyurur: **“Müşriklərin cəhənnəm sakinləri olduqları onlara bəlli olduqdan sonra, qohum olsalar belə, Peyğəmbərə və möminlərə onlar üçün bağışlanma diləmək yaraşmaz.”**(ət-Təubə:113) Lakin şirk əhlinə ədavət bəsləmək və onlardan razı qalmamaq o demək deyil ki, onlara söz yaxud əməl ilə pislik edilməlidir.Belə ki, müşrik valideyinlərə yaxşılıq etmək, kitab əhlindən olan zövcə ilə gözəl davranmaq lazımdır.Ümumi şəkildə kafirlərlə gözəl əxlaqla rəftar etmək İslam şəriətinin buyuruğudur. Uca Allah buyurur: **“Əgər onlar bilmədiyin bir şeyi Mənə şərik qoşmağın üçün səni məcbur etməyə cəhd göstərsələr, onlara güzəştə getmə! Dünyada onlarla gözəl davran.”** (Luqman:15) Habelə buyurur: **“Onlarla (zövcələrlə) xoş rəftar edin.”** (ən-Nisə:19) Habelə buyurur: **“Allah din uğrunda sizinlə vuruşmayan və sizi öz diyarınızdan qovub çıxartmayan kimsələrə yaxşılıq etmənizi və onlarla insafla davranmanızı sizə qadağan etmir.Şübhəsiz ki, Allah insaflı olanları sevir.”** (əl-Mumtəhənə:8) Bu, müamilə baxımından olur.Lakin şirk əhlini onların şirkində dəstəkləmək və haram işlərdə onlara yardımçı olmaq bəzi hallarda küfr dərəcəsinə çatan haram işlər səviyyəsində olur.Uca Allah buyurur: **“Sizlərdən kim onları özünə dost tutarsa, o da onlardandır.”** (əı-Maidə:51)

Uca Allahdan bizi şirk və fitnələrdən uzaq etməsini, həyatımızı və ölümümüzü və bütün davranışlarımızı və əməllərimizi yalnız Onun üçün müvəffəq etməsini diləyirik.Uca Allah buyurduğu kimi: **“De: Sübhəsiz ki, mənim namazım da, qurbanım da, həyatım da, ölümüm də aləmlərin Rəbbi Allah üçündür! Onun heç bir şəriki yoxdur.Mənə belə buyurulmuşdur və mən müsəlmanların birincisiyəm.”** (əl-Ənam:162-163)

Həqiqi elm Allah qatındadır.Sonuncu duamız: Aləmlərin Rəbbi Allaha həmd olsun! Allahın salavatı və salamı Muhammədə, onun ailəsinə, əshabına və qiyamət gününəcən gələcək qardaşlarına olsun.” (Şeyx Fərkusun rəsmi saytı: əqidə və tövhid fətvaları bölümü, fətvanın nömrəsi:667, fi subuti vasfi-ş-şirk məal cəhli qablə qiyamil huccə.)

Ağıl sahibi üçün alimlərin bu məsələdə hansı mövqedə olduqları açıq-aydın bəlli olur.Bu siyahını artırmaq da olardı lakin adı çəkilən böyük alimlərin sözləri, həmin məsələni anlamaq üçün yetərlidir.

Şeyx Salih əl-Fəuzan (hafizahullah)

İndi isə söz verildiyi kimi şeyx Salih əl-Fəuzanın bu məsələyə dair məzhəbi araşdırılacaq və şeyxin sözlərində ziddiyətin olduğunu düşünüb çaşqınlıq içində qalan bəzi qardaşlar üçün məsələ aydınlaşdırılacaq.

Belə ki, şeyx Fəuzandan gələn sözlər bir çox insanlar üçün müəmmalı qalır və onun hansı mövqedə olduğunu bəlli etmək onlar üçün çətin olur.Çünki bəzən şeyx Fəuzan təkfir üçün şərtlərin mövcud və maneələrin yoxluğunu şərt qoyur, bəzən isə şərtlər və maneələr qaydası olmadan təkfirin hasil olmayacağını

deyən şəxsin sözünü rədd edir. Lakin alimlərin bəzən "təkfir" sözünü dedikdə nəyi qəsd etdiklərini biləcəyin zaman bütün qaranlıq məqamlar sənin üçün aydınlaşacaq.

Birinci: Şeyx Salih əl-Fəuzanın şərtsiz və maneəsiz təkfir hökmünü verməsinə dair sözləri:

Sual: Allah sizin mükafatınızı versin! Növbəti sözləri deyən şəxs barədə nə deyərdiniz: Biz yalnız şərtlər mövcud olacağı maneələr isə aradan qalxacağı zaman müəyyən şəxsi təkfir edirik?

Şeyx Fəuzan: Bunu deyən kimdir?! Kimdən söz yaxud əməl yaxud etiqad yaxud şübhə yönundən küfr sadir olarsa onun küfrünə hökm veriləcək.Onun qəlbində olanı isə yalnız Allah bilir.Biz qəlbləri araşdırmaqla müvəkkəl deyilik.Bizim öhdəmisə düşən zahirdir.Bu səbəbdən, əgər biri küfrü izhar (aşkar) edərsə ona küfr hökmü verəcəyik və onunla kafir müamiləsi quracağıq.Onun qəlbində olan isə Allaha aiddir. Uca Allah qəlb işlərini bizim öhdəmizə buraxmamışdır." (şərhu nəvaqidil isləm)

Sual: Qəbirə sitayiş edənlərdən müəyyən şəxslərin təkfiri məsələsinin ixtilaflı məsələ olduğunu və onların əsli kafirlər olmadığını deyən bəzi müasirlərin iddiasına cavab olaraq nə deyərdiniz?

Şeyx Fəuzan: Bu, yaramaz sözdür.Bu cahillik nəticəsində ortaya gələn sözdür.Deyirəm və təkrar-təkrar təkid edirəm: Bu təhlükəli məsələlər barədə yalnız öyrənəndən, elmi artırdıqdan və əqidə mövzusunu elm əhlinin əli ilə doğru surətdə araşdırdıqdan sonra danışmaq icazəlidir. Bunun ardından əgər buna lüzum olarsa həmin məsələ barədə danışmaq olar.Lüzum olmazsa danışmaq gərək deyil.Mənim dediyim və təkrar-təkrar təkid etdiyim bu məsələnin çox təhlükəli olmasıdır.Belə ki, şirk edən şəxsə mürtəd

hökmü verilir.Küfr edən şəxsə, bizə aşkar olan işlərdə küfr hökmü verilir və ona kafirlərin əhkamları tətbiq edilir.Əgər həmin şəxs ölərsə müsəlmanların qəbiristanlığında dəfn edilmir, müsəlman yaxınları ona varis çıxmır və onun dediyi sözə yaxud etdiyi əmələ əsasən ona kafirlərin əhkamları tətbiq olunur.Bizə aid olan yalnız insanların zahiridir.Biz zahirə hökm veririk.Lakin onunla Allah arasında olanlara gəldikdə isə, əgər həmin şəxs üzürlüdürsə Allah onun halını daha yaxşı bilir.Onun işi Allaha aiddir.Biz qəlblərə hökm vermirik.Biz yalnız bizə aşkar olana hökm veririk.Bu səbəbdən, əgər biri küfrü və şirki izhar (aşkar) edərsə ona küfr və şirk hökmünü verəcəyik və istər həmin şəxs müəyyən şəxs olsun yaxud qeyrisi şirk və küfr əhkamlarını ona tətbiq edəcəyik." (şeyx Fəuzanın rəsmi saytı, hukmu ubbədil qubur)

Sual: Bütə səcdə edəni yaxud qəbirə qurban kəsəni təkfir etməliyikmi yoxsa hüccəti qaldırana qədər gözləməliyik?

Şeyx Fəuzan: Həmin şəxs bununla kafir olur.Lakin sən onun əməlinə küfr hökmü çıxarır və onu zahirdə təkfir edirsən.Daha sonra ona nəsihət etməlidir.Əgər tövbə edərsə məqsəd hasil olar.Əgər tövbə etməzsə həm zahirdə həm də, daxildə kafir olacaq." (şərhu-s-sunnə lil-bərbəhəri: 8-ci səsli yazı)[20]

Sual: Qəbirə sitayiş edənlər müəyyən olaraq kafirdirlərmi? Çünki biz bəzi insanların belə dediyini eşidirik: Bunlar cahil müsəlmanlardır.Onlar küfrə düşmüşlər.Bu səbəbdən, onlara müəyyən olaraq hökm verilmir. Bu doğru sözdürmü?

---

**[20] Dırnaq arası elm tələbələrindən biri güya şeyx Fəuzanın, Bərbəhərinin müəllifi olduğu "şərhu-s-sunnə" kitabına şərhini dinlədiyini və "təkfirçiləri", üstəlik "xəvariclәri" ifşa etdiyini iddia etmiş və qardaşların da şahidi olduqları digər artistliklər etmişdir.**

Şeyx Fəuzan: Kim küfr deyərsə kafir olar.Biz yalnız zahirə uyğun hərəkət edir və onlara kafirlərin əhkamlarını icra edirik.Madam ki, onlar Allahdan qeyrisinə qurban kəsir, ölülərdən yardım istəyirlər biz onlara küfr hökmü verir və onlara kafirlərin əhkamlarını icra edirik.Onlar öləndə biz onlar üçün bağışlanma istəmirik. **“Müşriklər qohum olsalar belə, Peyğəmbərə və möminlərə onlar üçün bağışlanma diləmək yaraşmaz.”** (ət-Təubə:113) Biz onların cənazə namazını qılmır, onları müsəlmanların qəbiristanlığında dəfn etmir və onlara kafirlərin əhkamlarını icra edirik.” (al-afak saytı, şeyx Fəuzanın səsli yazısı: sual; həl ubbədul qubur kuffərun biə`yənihim)

Sual: Allah sizi müvəffəq etsin! Mən başqa ölkədən gəlmişəm.Belə ki, mənim nənəm dünyasını dəyişmişdir.O, çox qoca və cahil olduğu halda övliyalar üçün qurbanlar kəsir və onlara and içirdi. Onun əvəzinə həcc edə bilərəmmi?

Şeyx Fəuzan: Xeyr! Bu adamla müşriklərin müamiləsi aparılır. Çünki həmin qadın şirk üzərə ölmüşdür.Bu səbəbdən, həmin adamla müşriklərin müamiləsi aparılır və onun əvəzinə həcc edilmir və onun üçün bağışlanma istənilmir.” (təthirul i`tiqad kitabının axırıncı dərsində verilən suallar)

Sual: Allah sizi müvəffəq etsin! Bu sözü deyən barədə nə deyərdiniz: Cahil müşrikə müşrik adı şamil olunur lakin əzablandırma və cəza yalnız hüccət qalxandan sonra olur?

Şeyx Fəuzan: Biz zahirə əsasən hökm veririk.Qəlblərdə olanları isə bilmirik.Allahın ona hansı hökmü verdiyini bilmirik.Bu səbəbdən, əgər biri şirki izhar (aşkar) edərsə ona müşrik hökmünü verəcəyik.Onun qəlbində olanlar Allaha aiddir.Məgər sən Allahdan qeyrisinə dua edən şəxsə müsəlman deyirsən?! Ona varis çıxır-

san?! Onunla evlilik qurursan?! Onu müsəlmanların qəbiristanlığında dəfn edirsən?! Həmin adam Allahdan qeyrisinə dua edir, sən isə deyirsən mən onun qəlbində olanı bilmirəm?! Bu, doğru deyil.Biz zahirə əsasən müamilə edirik.Qəlblərdə olanları isə Allah bilir." (şəhru əd-durri-n-nədıd fi ixləsi kəliməti-t-təuhid, li-ş-şəukani, onuncu dərs)

Şeyx Salih əl-Fəuzanın yuxarıda qeyd olunan sözlərindən aşağıdaki nəticələr çıxır:

1-Şeyx Fəuzan insanın zahirinə əsasən müşrik hökmü vermək üçün şərtlərin mövcud olmasını və maneələrin aradan qalxmasını qeyd etmir.

2-Şeyx Fəuzan zahirə verilən hökmə əsasən onlarla kafir müamiləsini isbat edir.Yəni, onlar öləcəyi zaman onlar üçün bağışlanma istənilmir, onların cənazəsi qılınmır, onların kəsdikləri ət yeyilmir, onlarla evlilik qurulmur və digər əhkamlar.

3-Şeyx Fəuzan üzərindən hüccət qalxmayan şəxsə, yuxarıda özünün qeyd etdiyi kimi zahiri təkfir hökmünü verir.Lakin insanın üzərindən hüccət qalxacağı zaman ona həm zahiri həm də, daxili küfr hökmünü verir.Təhqiq əhlinin məzhəbi də, məhz budur.Çünki zahiri təkfir insanın qətlə yetirilməsinə və digər hökmlərə yol açmır.Axirətdə də, cəhənnəmlik olacağına və əzab dadacağına qəti əminlik ifadə etmir.Lakin hüccətin qalxmasından sonra çıxarılacaq zahiri və daxili təkfir hökmü həm dünyavi həm də, uxravi cəzanı sabit edir.

İndi isə şeyx Salih əl-Fəuzanın yalnız şərtlər olacağı və maneələr aradan qalxacağı zaman təkfir hökmünün hasil olacağına dair

sözlərinə, habelə cahilin üzürlü olacağına dair sözlərinə nəzər yetirək:

Sual: Küfrlə vəsf etməklə müəyyən şəxsə küfr hökmünü vermək və müəyyən şəxsin küfrünü etiqad etmək arasında fərq nədədir?

Şeyx Fəuzan: “Allahdan qeyrisinə dua etmək, ona qurban kəsmək, ondan yardım istəmək, dinlə istehza etmək və dini söymək kimi işlər, heç şübhəsiz ki, alimlərin icması ilə küfrdür.

Lakin bu işləri edən şəxsə gəldikdə, onun halına baxılmalıdır. Əgər həmin şəxs cahildirsə yaxud yanlış yozursa yaxud təqlid edirsə, ona bəyan edilənəcən ondan küfr hökmü dəf edilir və ona haqq bəyan edilir.Çünki onun şübhəsi yaxud cahilliyi ola bilər. Hüccət qalxmayınca həmin şəxsə küfr hökmünü verməyə tələsmək olaz.Onun üzərindən hüccət qaldırılacağı lakin həmin şəxs öz işində davam edəcəyi zaman ona küfr hökmü veriləcək.Çünki artıq onun heç bir üzürü yoxdur.” (şərhu risaləti-d-dələil fi hukmi muvaləti əhlil işrak, 212-ci səh.suallar)

Şeyx Fəuzanın bu sözlərindən açıq-aydın görünür ki, şeyx burada üzərindən hüccət qalxmayan şəxsin axirətdə olan üzürü haqqında danışır.Çünki şeyx qeyd edir ki, həmin insanın üzərindən hüccət qalxacağı zaman onun heç bir üzürü olmayacaq.Yəni, şeyx bu məsələdə öz məzhəbinə əsasən həmin şəxsə həm zahiri həm də, daxili küfr hökmündən danışır.Lakin onun sözlərində həmin şəxsin hüccətdən öncə müsəlman olacağı qeyd olunurmu?! Cavab: Xeyr!

Sual: Şirk edən müsəlman, etdiyi əməlin şirk olduğu haqda cahil olarsa üzürlü sayılacamqı?

Şeyx Fəuzan: Onun yanından onu öyrədəcək insan olmayacağı və şirk haqqında heç bir şey eşitməyəcəyi və ona bu barədə heç bir şey çatmayacağı zaman həmin şəxs cahilliyində üzürlü olacaq. Lakin insan Quranı eşidəcəyi, hədisləri eşidəcəyi, dəvətçiləri dinləyəcəyi, mühazirələri eşidəcəyi və kitablar oxuyacağı zaman üzürlü olmayacaq." (Səudiyyə Ərəbistanının dövlət televiziyasında 2012-ci ildə verdiyi fətva)

Bu fətvadan aydın görünür ki, şeyx dindən heç bir bilgisi olmayan insanlar haqqında söhbət edir və həmin şəxsləri, din haqqında heç bir şey eşitməyən fətra əhli qisminə aid edir.Çünki şirk haqqında heç bir bilgisi olmayan insan, icma ilə müsəlman sayıla bilməz. Buna dəlil olaraq şeyx Fəuzan "əl-uzr val cəhlu bihi" adlı məqalə-sində demişdir:

"Birinci: Dəvət və Quran çatmayan şəxs cahilliyi səbəbilə üzürlü olur və ona "fətra əhli"nin hökmü verilir.

İkinci: Əgər birinə, şirk və böyük günahlar kimi zahiri işlərdə müxalif olmağa dair dəvət və Quran çatarsa insan üzürlü olmaya-caq.Çünki onun üzərindən hüccət qalxmışdır."

Bəlli olur ki, şeyx onları müsəlman deyil fətra əhli qisminə daxil edir.Fətra əhli ilə isə bu dünyada kafir müamiləsi görülür.

Habelə böyük şirk edəni müsəlman adlandırmaq şeyxin bu məsələdə olan məzhəbinə tamamilə ziddir.Şeyx Fəuzanın növbəti fətvasına diqqətlə nəzər yetirin!

Sual: Əgər biri qəbirləri təvaf etmək kimi küfr əməl edərsə və elm çatmadığına görə cahilliyində üzürlü olarsa, ona müsəlman hökmü veriləcəkmi yoxsa o, cahilliyində üzürlüdür?

Şeyx Fəuzan: Xeyr! Əgər biri böyük şirk edərsə zahirinə əsasən ona küfr hökmü çıxarılacaq.Artıq mən sizə izah etmişəm ki, biz zahirə uyğun hərəkət edirik.Bu səbəbdən, əgər biri şirk sözü dilə gətirərsə yaxud şirk əməl edərsə biz onun müşrik, kafir olacağını deyəcəyik.Biz onunla müşriklərin müamiləsini aparacağıq.Onun cahil yaxud üzürlü olması məsələsinə gəldikdə isə, bu Uca Allaha aid olan məsələdir.Bu səbəbdən, əgər qəbirlərə yaxud məzarlara ibadət edən müşriklər ölər yaxud öldürülərsə, biz onlarla müsəlman müamiləsi aparmayacağıq.Biz sadəcə bizə zahir olan küfrə və şirkə əsasən onlarla müamilə edəcəyik.” (al-afak saytı, şeyx Fəuzanın səsli yazısı; həl mən yə`məlu-ş-şirk bicəhlin yusəmmə muslim)

Sual: Allah sizi müvəffəq etsin: Hər hansı bir şəxsə təkfir hökmünü çıxaran adam kim olmalıdır?

Şeyx Fəuzan: Buna elm və bəsirət əhli hökm verirlər.Əhkamları bilən və onu yerində tətbiq edən şəxslər.Bunu avam insanlar, saxta elm əhli yaxud nəfsi istəklərinə uyanlar etmir.Buna yalnız elm və bəsirət əhli hökm verirlər.Hər hansı bir şəxsin iman gətirəndən sonra kafir olacağına hökm vermək üçün elm və bəsirət əhlinin olması labüddür.Müəyyən şəxsin üzərindən qazinin yanında hüccəti qaldırmaq labüddür.Çünki ola bilər ki, həmin şəxsin üzürü olsun.Bəzən insan (bir şeyi) yanlış yozur. Müəyyən şəxs yalnız qazinin yanında, şər`i məhkəmədə təkfir olunur. Ümumi olaraq filan şeyi edən kafirdir, Allahdan qeyrisinə dua edən kafirdir, Allaha şərik qoşan kafirdir, Allahdan qeyrisi üçün qurban kəsən kafirdir sözlərinə gəldikdə isə, insan ümumi olaraq təkfir ediləcək.Lakin müəyyən şəxs yalnız qazinin yanında təkfir oluna bilər.Çünki ola bilsin ki, həmin şəxsin üzürü vardır.Ola bislin ki, cahil olsun, olan bilsin ki, (küfr etməyə) məcbur edilsin

yaxud yanlış yozsun.Onun üzürü ola bilər.Bu səbəbdən, bunun qazinin yanında olması labüddür.” (Şeyx əl-Fəuzanın rəsmi saytından alıntı: Sualın başlığı: mənil-ləzi yəhkumu bi-t-təkfir alə-ş-şəxs)

Şeyxin bu sözləri, onun və təhqiq əhli alimlərin “təkfir” məsələsində məzhəbini bilən şəxs üçün qətiyyən qaranlıq qalmır və burada hansı təkfirdən söhbətin getdiyi həmçinin bəllidir.Yuxarıda keçən şeyx Fəuzanın fətvalarında, onun cahillikdən böyük şirk edən şəxsin müşrik adlanacağına dair açıq-aydın kəlamları gəlir.Belə ki, şeyx burada elm əhlinin etdiyi və qazinin (şəriətlə hökm verən hakimin) yanında olan təkfirdən danışır.Belə ki, şeyx burada təkfirin müəyyən mərhələsi haqqında danışır.Yəni, insanın üzərindən qazinin yanında hüccət qalxacağı zaman artıq ona mürtədin əhkamları icra ediləcək.Lakin qazinin yanında hasil olan təkfirdən öncə böyük şirk edən şəxsin müşrik adlanması sabitdir.

Belə ki, şeyx Fəuzan (rahiməhullah) bu məsələyə digər fətvalarda açıqlama gətirir:

Sual: Allah sizi müvəffəq etsin! Müəyyən bir şəxsə müşrik hökmünü vermək yalnız alimlərə aiddir yoxsa avam insanlardan biri şirkə düşəni görəcəyi zaman beləsinin kafir və müşrik olduğunu deməsi lazımdır?

Şeyx Fəuzan: “Kim şirki izhar (aşkar) edərsə o, müşrikdir.Kim Allahdan qeyrisini çağırar, Allahdan qeyrisinə qurban kəsər və nəzr edərsə, həmin şəxs həm avam insanlar həm də, alimlər qatında müşrik olar.Ey Əli! Ey Hüseyn!-deyən şəxs müşrikdir və bunu hamı bilir.Bəli!

Sual verən davam edir: Allah sizi müvəffəq etsin! Elm tələbələrindən biri şirkə düşən şəxsin kafir olduğunu bəyan edərkən

demişdir: Lakin ona kafir və mürtəd hökmünü vermək hər adama aid deyil.Hətta alim və elmdə imam olan şəxsə aid deyil və bu sadəcə qaziya aid olan məsələdir?

Şeyx Fəuzan: Mürtədlik hökmü, təbii ki, qazi yanında verilir.Çünki həmin şəxs qətlə yetirilir.Lakin bunun şirk olduğunu hamı deyir.Qəlbində imanı olan hər bir şəxs bunu deyir və bunun üçün qazinin yanına getməyə ehtiyac yoxdur." (şərhu əd-durri-n-nədıd, li-ş-şəukəni, birinci səsli yazı)

Sual: Təkfir hökmünü vermək kiçik elm tələbələrindən olan hər bir şəxsə aiddir yoxsa bu, böyük alimlərə və qazilərə aiddir?

Şeyx Fəuzan: Şirki izhar edən, Allahdan qeyrisi üçün qurban kəsən yaxud nəzr edən, açıq-aydın şəkildə (şirk edən), Allahdan qeyrisi üçün qurban kəsən, Allahdan qeyirisi üçün nəzr edən, Allahdan qeyrisindən yardım istəyən, ölülərə dua edən şəxsin şirki aşkardır.Beləsinin şirki aşkardır.Bu səbəbdən, əgər biri bunu eşidərsə ona küfr və şirk hökmü verəcək.Lakin elmin və bəsirətin olmasını tələb edən gizli məsələlərə gəldikdə isə bu işlər elm əhlinin öhdəsinə buraxılır." (şərh nəvaqidil isləm, dördüncü səsli yazı)

Şeyxin sözlərindən aydın olur ki, müsəlman bir insanın böyük və aşkar şirk etdiyini görəcəyi zaman ona müşrik hökmünü verəcək və bunun üçün qazinin yanına getmək gərəkli deyil.Bu, sadəcə insanın zahirinə verilən hökm və qiymətdir.Belə ki, insan zina edəcəyi zaman qazinin çıxaracağı hökmdən öncə həmin şəxsin zina etdiyi lakin zinakar adlanmadığı deyilməyəcək.Əslində həmin şəxs zinakar sayılır.Lakin həmin şəxsə cəzanın icra edilməsi üçün qazinin hökm verməsi labüddür.Habelə "təkfir" məsələsi mərhələli şəkildə də, ifadə olunur: İlk öncə insan böyük şirk edəcəyi zaman

onun zahirinə əsasən müşrik hökmü çıxarılır.Bu hökmü həm adi insanlar, həm də digərləri çıxarırlar.Lakin təkfirin bu növü, yəni zahiri küfr, insanın qanını və malını halal etmir və axirətdə cəzanı gərəkli etmir.Lakin bu hal üzərə ölən şəxsə kafirlərin dünyavi əhkamları icra olunur.Yəni, həmin şəxs öləcəyi zaman ona cənazə namazı qılınmır, müsəlmanların qəbiristanlığında dəfn edilmir, kəsdiyi ət yeyilmir, onunla evlilik qurulmur, müsəlman ona varis çıxmır v.s. Daha sonra alim yaxud hüccəti qaldırmaq səriştəsində olan şəxs müşrikin üzərindən hüccəti qaldıracağı zaman həmin şəxs öz şirki üzərə israrla durarsa, ona həm zahiri həm də, daxili küfr hökmü çıxarılır. Təkfirin bu növü hər bir insana aid deyil. Bunu alimlər yaxud hüccət qaldırmaq səriştəsinə malik olan insanlar edirlər.Lakin hüccətdən sonraki təkfir hökmü insanı dünya və axirət cəzasına layiq edir. Bunun ardından isə üzərindən hüccət qaldırılan müşrik, qazi yanında tövbəyə çağırılır (əl-isti-təbə).Həmin insan şirkdən tövbə edəcəyi zaman rahat buraxılır. Lakin şirki üzərə israrla duracağı zaman şəriət hökmü verilən yerdə həmin şəxsin mürtəd olaraq qətlə yetirilməsi, mal-mülkü-nün beytul-mala keçməsi kimi dünyavi hökm icra edilir və bu hal üzərə ölən şəxs axirətdə əzaba düçar olur.

Sual: Hüccət qalxmayana qədər qəbirə sitayiş edənləri təkfir etməyənin hökmü nədir? Beləsi kafirdirmi yoxsa onun küfründə dayanmaq gərəkdir.Çünki İslam dininin qaydalarından birinə əsasən kafirləri təkfir etməyən yaxud onların küfründə şübhə edən şəxs kafir olur.Bu əməl küfrdürmü yoxsa orada təfsilat vardır?

Şeyx Fəuzan: Qəbirə ibadət edənlərin üzərindən hüccət qalx-mayana qədər onların təkfir edilməyəcəklərinə dair sözdə təfsilat vardır.Əgər onun dediyi söz doğrudursa və onlara hüccət çatma-

yıbsa, habelə onlar təcrid olunmuş bir cəmiyyətdə yaşadıqları və onlara dəvət çatmadığı, habelə onlar Quranı və hədisləri eşitmədikləri üçün hüccətin qaldırılmasına möhtacdırlarsa, hüccət qaldırılmamış onlar təkfir olunmayacaqlar.Çünki onlara hüccət çatmamışdır.Lakin əgər onlar müsəlmanların arasında olsalar, Quranı və hədisləri eşitsələr, habelə kitablar oxusalar, artıq onların üzərindən hüccət qalxmışdır.Madam ki, onların üzərindən hüccət qalxdığı halda onlar Allahdan qeyrisinə ibadət edirlər, onlar və onlara bu işdə müvafiq olanlar təkfir ediləcəklər." (Şeyx əl-Fəuzanın rəsmi saytından alınmış səsli yazı: iqamətul hüccə alə ubbədil qubur qablə təkfirihim)

Bu fətvada həmçinin şeyx Fəuzan həmin insanların üzürlü olacaqlarını desə belə, onlara İslam hökmünü isbat etmir.Şeyx Fəuzanın sözlərini nəql edib onun qəsdini təhrif edən şəxslərin Allahdan qorxub alimin qəsd etmədiyi mənaları ona aid etməməsi gərəkdir.Çünki bu, elmi xəyanət sayılır.Belə ki, şeyx Fəuzana sual verilmişdir: Fəzilətli şeyx! Eşitmişik ki, siz ölülərə dua etmək kimi böyük şirkə düşən şəxsin təkfirindən dönmüsünüz və cahilliyin üzr olması məsələsində hüccətin qaldırılmasını şərt qoymusunuz?

Şeyx cavab olaraq demişdir: "Bu, batil sözdür.Bu,mənim adımdan deyilən yalandır.Mən müşrikin və kafirin təkfirindən dönməmişəm. Mən bundan dönməmişəm.Çünki bu, haqdan dönməyi ifadə edir."(durusul haramil məkkiy, üçüncü səsli yazı, 53-cü dəqiqə)

Bu sözlərdən, aydın görünür ki, şeyx zahiri təkfirdən danışır və bundan dönmədiyini deyir.Lakin şeyxin sözlərini təhrif edənlər zahiri və daxili təkfirə aid olan sözləri gətirib şeyx Fəuzanın hüccətdən sonra təkfir etdiyini, bundan öncə isə həmin şəxsə müsəlman hökmünü verdiyini göstərməyə çalışırlar.

Bəzi şübhələrin ifşa edilməsi:

Şeyx Fəuzana sual verilmişdir: Rusiyadan olan bir nəfər soruşur: Məlum olduğu kimi, bizim ölkələrimiz yetmiş ildən çox vaxt ərzində sovet hakimiyyəti altında olmuşdur.Allaha həmd olsun ki, hal-hazırda İslam dini yayılmışdır.Lakin islama nisbət olunan bir çoxları islamın gerçəyini bilmirlər.Onlar etiqad edirlər ki, islam Allaha, mələklərə, kitablara iman etməkdir.

Şeyx Fəuzan: Bu, müsəlmanların etinasızlığı ucbatındandır. Müsəlmanlara onların yanına getmək və onları öyrətmək vacibdir.Bu, müsəlmanların qardaşları qarşısında borcudur. Müsəlmanlara ora getmək, onlara öyrətmək və İslamı anlatmaq gərəkdir.Habelə onlardan tələbələri cəlb edib İslam üniversitetlərində onları oxutmalıdırlar ki, onlar tövhidi, əqidəni, fiqh elmini, hədisi, təfsiri və digər elmləri bilsinlər.Daha sonra ölkələrinə qayıdıb Allahın yoluna dəvət etsinlər.Müsəlmanlar öz qardaşlarını diqqətsiz qoymamalı və onları cahillik üzərə buraxmamalıdırlar.

Sual verən: Daha sonra sualın davamında deyir: Biz onlarla necə müamilə etməliyik? Onların kəsdikləri əti yeyək, onların qadınları ilə evlənək, habelə onların cənazələrini müşaiyət edəkmi?

Şeyx Fəuzan: Madam ki, onlar İslamı izhar (aşkar) edir və özlərini İslama nisbət edirlər, bununla birgə onlarda cahillik varsa onlar müsəlmandırlar və onlarla müsəlman müamiləsi aparılmalıdır. Ancaq onları başlı-başına tərk etmək olmaz.Onlara İslamı izah etmək və bəyan etmək labüddür.”

Bəzi insanlar şeyx Fəuzanın bu fətvasını özləri üçün dəlil hesab edirlər.Əslində şeyx Fəuzanın sözləri onların lehinə deyil əleyhinədir.Belə ki, Rusiyadan gələn sualda insanların böyük şirk edib

özlərini İslama nisbət etmələri qeyd edilmir.Orada yalnız deyilir ki, həmin insanlar özlərini İslama nisbət edir lakin İslamın gerçəyini bilmirlər.İnsanın İslamın gerçəyini bilməməsi müxtəlif cür anlaşıla bilər.Belə ki, bəzi bidət əhli haqqında onların İslamın gerçəyini anlamadıqları və bilmədikləri deyilir. Lakin bu, onların təkfir edilməsi üçün zəmin yaratmır.Habelə həmin fətvada şeyx Fəuzan deyir: "Madam ki, onlar İslamı izhar (aşkar) edir və özlərini İslama nisbət edirlər, bununla birgə onlarda cahillik varsa onlar müsəlmandırlar və onlarla müsəlman müamiləsi aparılmalıdır." İslamı izhar edirlərsə onlarla müsəlman müamiləsi aparılır. İslamı izhar etmək isə, heç şübhəsiz ki, İslamın buyuruqlarını yerinə yetirmək və İslamı pozan amillərdən kənar durmaqdır. Məgər biri qəbirlərə ibadət edəcəyi zaman onun İslamı izhar etdiyi deyiləcəkmi?! Bununla da, şeyx Fəuzan həmin fətvada şeyx öz üslubuna sadiq qalaraq zahirə əsasən hökm çıxarır.Lakin qeyd edildiyi kimi, həmin şəxs sualında həmin yerlərdə edilən böyük şirk haqqında soruşmur və bu cür insanların halını aydınlaşdırmağı tələb etmir.Şeyx Fəuzan isə öz növbəsində verilən suala uyğun cavab verir.Lakin məsələ daha da aydınlaşsın deyə, yenə də Rusiyadan, artıq başqa tərzdə verilən suala diqqət yetirək.

Şeyx Fəuzana sual verilmişdir: Allah sizi müvəffəq etsin! Biz Rusiyanın cənubunda yaşayırıq.İslama nisbət olunan bir çoxları dinlərini sufilərdən götürdüklərinə görə böyük şirkə düşürlər. Sual:Biz bunlarla necə müamilə etməliyik? Onlarla müşrik müamiləsi aparmalıyıq yoxsa cahil müsəlman müamiləsi aparmalıyıq?

Şeyx Fəuzanın cavabı: Siz özünüz də, bilirsiniz ki, onlar müşrikdirlər.Lakin onları bu hal üzərə buraxmayın.Onları Allaha çağırın, bəyan edin. Ola bilsin ki, onlar cahildirlər.Onları Allaha çağırın və bəyan edin.Bildiyiniz haqqı onlara bəyan edin.Ola bilsin

ki, Allah onlara hidayət versin.Əgər qəbul etməsələr onları tərk edin və onlardan uzaqlaşın. **“Sən istədiyinə hidayət verə bilməzsən, lakin Allah istədiyinə hidayət verir.”** Bəli!” (şərhu fəthil məcid)

Eyni ölkədən gələn iki fətvanı və sualların qoyulma üslubunu anlayacağın zaman bir çox şübhələr və qaranlıq məqamlar sənin üçün aydın olacaq.Allah hamını doğru yola müvəffəq etsin!

Habelə “Azərbaycan haqqında şeyx Fəuzanın fətvası” başlığı ilə gələn fətva barədə açıqlama vermək istərdik.İlk öncə bu fətvanın Azərbaycan haqqında şeyx Fəuzanın fətvası adlandırmaq yanlışdır.Çünki fətva verilən suala uyğun verilir və Azərbaycanın həqiqətən sualda olduğu kimi vəsf edilməsi mübahisə doğurur, üstəlik deyərdik ki, həqiqətə uyğun deyil.Şeyx Fəuzan sadəcə verilən sualda vəsf edilən durum haqqında söz söyləyir.Habelə bəzi insanlar, cahilliklərindən bu fətvanın “təkfirçilərin” belini qırdığını iddia etmiş, quyruq bulayanlar və facebook şeyxləri isə bu fətvanı əllərində şüar tutub onu az qala şeyx Fəuzanı tanımayan insanlarla paylaşmağa girişmişlər.Lakin bəzi sadiq qardaşlar,-Allah onları qorusun-şeyxin bu sözlərindən çaşqınlığa düşmüş və bu fətvanın gerçək məzmununu anlamamışlar.Bu səbəbdən, həmin fətvanın məzmunu izah ediləcək.Beləliklə həmin fətva:

Sual: Azərbaycandan olan elm tələbəsi sual verir.Sual verən deyir: Bir kişi xüsusi olaraq bizim ölkədə şirk edir.

Şeyx Fəuzan: Hazırda böyük şirk edən insanlar o qədər çoxdur ki, istər sizin ölkədə olsunlar istərsə də qeyrisində.Bəli!

Sual verən: Bizim ölkədə bir kişi böyük şirk etmişdir.Lakin bizdə Quranın tərcüməsi, habelə səhih Buxari və səhih Muslim tərcümə olunub.

Şeyx Fəuzan: Quranı tərcümə etmək mümkün deyil.Tərcümə oluna biləcək təfsirdir, Quranın mənalarıdır.Quranı isə tərcümə etmək mümkün deyil.Allahın kəlamı digər dilə çevirilə bilməz, qətiyyən.Bəli!

Sual verən: Habelə digər tövhid kitabları və elmi dərslər mövcuddur.Bununla birgə onlar (şirk edənlər) üzürlü sayılırlarmı?

Şeyx Fəuzan: Bəli, sayılırlar! Kitabları olduğu halda azmış insanlar olur.Həmin insan onu anlamır və bilmir.Onun nəhəng kitabxanası var lakin doğru yoldan azır.Allah qorusun! Çünki həmin şəxs faydalı elmi anlamır və elmi alimlərdən götürmür.Kitablar kifayət deyil.Quranın təfsirinin tərcüməsi, habelə səhih kitabların, müsnədlərin və sünənlərin tərcüməsi kifayət etmir.Bu, kifayət etmir. Alimin olması labüddür.İnsanlara bəyan edən və tədris əsaslarına uyğun olaraq onları öyrədən alimlərin olması labüddür.Lakin yalnız kitabların olması heç də kifayət etmir.Bu, qorxağın əlində olan silah mislindədir.Əgər sənin evin silahla dolu olarsa lakin sən qorxaq olarsan və silahı istifadə edə bilməzsənsə bunun sənə heç bir faydası olmayacaq."

Artıq şeyx Fəuzanın bu məsələyə dair məzhəbi bəlli olandan sonra, aydın olur ki, cahil insanlar üçün həmin sözlərdə heç bir dəlil yoxdur və şeyx burada ehtimal olunan cahilliyin üzürlü olacağı haqqında danışır.Lakin qeyd etdiyimiz kimi şeyx Fəuzan və digər alimlər böyük şirk edən şəxsin cahilliyində üzürlü olduğunu desələr belə onun müsəlman olduğunu demirlər.Üstəlik onun müşrik olacağını deyirlər.Bu fətvada həmçinin şeyx Fəuzan eyni

minvalla hərəkət edir.Bu adamlara sual oluna bilər: Şeyx həmin fətvanın harasında şirk edəni müsəlman adlandırır? Ümumiyyətlə nəinki bu fətvada, digər fətvaların harasında böyük şirk edəni müsəlman adlandırır?! Elə isə, onun böyük şirk edən şəxsi müsəlman gördüyünü demək şeyx Fəuzanın sözləri deyil onun sözlərini anlamayanların yaxud qərəzli şəkildə onun sözlərini saxtalaşdıran şəxslərin gəldikləri nəticədir.Uca Allah buyurur: **“Əgər doğru deyirsinizsə dəlilinizi gətirin!”** (əl-Bəqərə:111) Habelə həmin sual dolğun verilməmiş və burada Allahın dininə çağıran şəxslərin və onlara Allahın dinini anlatan insanların olduğu qeyd edilməmişdir.Bu səbəbdən, şeyx Fəuzan cavab olaraq demişdir: “Alimin olması labüddür.İnsanlara bəyan edən və tədris əsaslarına uyğun olaraq onları öyrədən alimlərin olması labüddür.Lakin yalnız kitabların olması heç də kifayət etmir.” Təbii ki, alim dedikdə, şeyxin də, qeyd etdiyi kimi insanlara onların dinini öyrədən şəxslərin olmasını qəsd edir.Çünki insan biləcəyi işi insanlara doğru surətdə çatdıracağı zaman gözəl bildiyi elmin alimi sayılacaq. Məgər şeyx burada Fəuzan yaxud Albani yaxud ibn Bəz kimi alimlərin olmasını şərt qoyur ki, burada şirk edənlərin üzürü kəsilsin?! Yaxşı, dəvətçilər və xaricdə təhsil alan insanlar Allahın dinini təbliğ etmirlərmi?! Məgər həmin tələbələr insanları şirkdən çəkindirmək iqtidarında deyillər ki, həmin şirk edən insanlar üçün şeyx Fəuzan kimi alimlər durub gəlsin onların üzərindən hüccəti qaldırmağa?! Yoxsa onların misalı həmin fətvada şeyx Fəuzanın dediyi kimi əlində silah olan qorxağın misalındadır?! Yenə də, insanların müəyyən bölgədə üzürlü olduqları deyilərsə belə, onlardan böyük şirk edən şəxslərin müsəlman olduğu deyilməyəcək. Vallahul mustəan!

Alimlərdən nəql olunan sözlər və onların şirk edənə, qeyd olunan təfsilata uyğun olaraq müşrik adını verdikləri bəlli olacağı zaman, qardaşları “xəvariclik” yaxud “təkfirçilik”də ittiham edən şəxslərə deyiləcək: Bunun xəvariclərin məsləki olduğunu isbat edin, əks halda haqsız yerə qardaşların əsassız ittiham edilməsi tərk edilməlidir! Təbii ki, onların içində olanlardan bəzisi deyəcəklər: Sizin bu sözləri gətirməkdə məqsədiniz başqadır! Yəni, bunlar zahirə hökm vermək əvəzinə insanların qəlblərini və məqsədlərini araşdırmağa girişəcəklər.Habelə bəziləri “məsləhət və məfsədət” bəhanəsini gətirəcəklər.Lakin bunlara deyiləcək ki, burada söhbət müəyyən ölkədən yaxud müəyyən şəxsdən getmir.Burada Əhlu Sünnənin bu məsələyə dair əqidəsinin ortaya qoyulmasından gedir. Məgər məsləhət naminə müşriki müsəlman adlandırmaq olarmı?! Habelə burada olan müsəlmanların qəsdi və niyyəti barədə zənniniz yaxşı deyilsə, heç olmasa alimlər haqqında zənni gözəlləşdirin və onların həmin önəmli məsələdə məzhəbinə tabe olun ki, bu məsələdə cəhmiyyə firqəsi ilə birgə deyil Əhli Sünnənin sıralarında olasınız!

Son olaraq Allahdan bizə haqqı haqq olaraq göstərib ona tabe olmağa müvəffəq etməsini, batili isə batil olaraq göstərib ondan kənar durmağa müvəffəq etməsini arzulayırıq!

Aləmlərin Rəbbi Allaha həmd olsun!

Allahın salavatı və salamı Peyğəmbərimiz Muhamməddə, onun ailəsinə və səhabələrinə olsun!